*Rafiq İsmayılov*
*Gülşən Orucova*
*Zahid Xəlilov*
*Dilrubə Cəfərova*

# AZƏRBAYCAN DİLİ

Ümumtəhsil məktəblərinin
2-ci sinfi üçün dərslik

Azərbaycan Respublikası Təhsil Nazirliyinin
15.07.2009-cu il tarixli, 945 №-li əmri ilə
təsdiq edilmişdir.

*Rafiq İsmayılov*
*Gülşən Orucova*
*Zahid Xəlilov*
*Dilrubə Cəfərova*

**AZƏRBAYCAN DİLİ (2-ci sinif üçün dərslik)**
Bakı: Altun Kitab, 2011. - 208 səh.

Rəyçilər *p.e.n. İradə Cəfərova*
*Bakı şəhəri, T.İsmayılov adına "İntellekt" məktəb-liseyin metodist müəllimi*
*Mehriban Qocayeva*
*Bakı şəhər 18 №-li orta məktəbinin müəllimi*

Redaktor *Fəxri Uğurlu*

Rəssamlar *Elçin Cabbarov*
*Səidə Eyvazova*

Korrektor *Kəmalə Cəfərova*

Bədii tərtibat *Rafiq İsmayılovundur.*

Yazıçı və şairlərin dərslikdə istifadə olunan əsərləri dərslik müəllifləri tərəfindən müvafiq yaş qrupu üçün uyğunlaşdırılmışdır.
Müəllifi göstərilməyən mətnlər dərslik müəlliflərinindir.



ISBN 978-9952-24-043-6

# MÜNDƏRİCAT

BÖLMƏ 1

# DƏYƏRLƏRİMİZ

- Səs və hərf
- Sait və samit səslər
- Sözün sətirdən-sətrə keçirilməsi
- Əlifba
- Lüğətdən istifadə



# BİLİK GÜNÜ



Elmə yiyələnmək həmişə şərəfli iş sayılıb. Bilikli adamlara hər yerdə hörmət edirlər. Öz biliyini başqalarına öyrədən müəllimlər isə daha böyük nüfuza malikdir. Qədimdə ən böyük hökmdarlar, sərkərdələr də müəllimin sözündən çıxmır, onun xahişini yerə salmırdı.

Azərbaycanda hörmətli adamlara «müəllim» deyə müraciət edirlər. Deməli, xalqımız müəllim əməyinə yüksək qiymət verir.

Ölkəmizdə dərslərin başlandığı gün bilik bayramı kimi qeyd olunur. Əvvəllər bu bayram sentyabrın 1-də keçirilirdi. İndi Prezident İlham Əliyevin *fərmanı* ilə məktəblərdə dərslər sentyabrın 15-də başlanır. Həmin gün Azərbaycanda Bilik Günüdür.

## Sözlük

***Fərman*** — dövlət başçısının verdiyi qərar

## Şüurlu oxu

**1** "Bilik Günü" mətnində hansı suala cavab yoxdur?

A) Azərbaycanda Bilik Günü hansı gündür?
B) Müəllim Günü hansı gün qeyd olunur?
C) Azərbaycanda dərslər nə vaxt başlanır?

## Söz ehtiyatı

**2** *"Sərkərdə"* sözünü necə izah etmək olar?

A) ölkə rəhbəri
B) qoşun başçısı
C) adi döyüşçü

**3** Yaxın mənalı sözləri müəyyən et.

*Nümunə:* 1– C

| | | | |
|---|---|---|---|
| 1 | yiyələnmək | A | ustad |
| 2 | müəllim | B | rica |
| 3 | sözündən çıxmaq | C | əldə etmək |
| 4 | hörmət | Ç | əməl etməmək |
| 5 | xahiş | D | kəlmə |
| 6 | söz | E | nüfuz |

## Düşün və cavab ver

**4** Hansı atalar sözündə öyrənməyin vacibliyindən bəhs olunur?

A) Uşağa yüz öyrət, gördüyünü deyəcək.
B) Əyri oturaq, düz danışaq.
C) Bilməmək eyib deyil, soruşmamaq eyibdir.

## Dil qaydaları

**5** Sözlərdən birində üç samit yanaşı yazılıb:

A) sərkərdə B) prezident C) hökmdar

**6** Hansı sözdə iki sait yanaşı yazılıb?

A) müraciət B) hörmət C) şərəf

QAYDALAR **SƏS, HƏRF. SAİT VƏ SAMİT SƏSLƏR**

Sözlər səslərin birləşməsindən yaranır. Məsələn, «kitab» sözündə beş səs var: k, i, t, a, b.

Səslər iki cür olur: saitlər və samitlər. Samitlərdən fərqli olaraq, sait səsləri tələffüz zamanı uzatmaq olur.

Səsləri yazıda hərflərlə işarə edirlər.

Səsləri eşidirik, hərfləri isə görürük.

Sözlük

***Tələffüz etmək*** – demək, səsləndirmək

Tətbiqetmə

1. Hansı saitləri aşağıdakı samitlərin arasına qoyduqda söz yaranar?

y...d, b...l, t...y, d...n, t...r

2. Adları elə düz ki, onların baş hərflərindən «kitab» sözü alınsın.

*Adil, Babək, İlqar, Kazım, Tofiq*

3. Hansı hərf «badam», «sabun», «innab» sözlərinin hamısında var?

A) d B) n C) b

4. Sözlərdən birində «k» fərqli tələffüz olunur:

A) tank B) sakit C) klub

5. «Dəf...ər» sözündə nöqtələrin yerinə hansı hərf yazılmalıdır?

A) t B) d C) n

6. «A...a». Nöqtələrin yerinə hansı hərf yazılsa, «su ilə əhatə olunmuş quru yer» mənasını verən söz alınar?

A) ğ B) n C) d

# BAYRAQLAR

## I MƏTN

Bayraq qədim zamanlarda yaranmışdır. Əvvəllər bayraqları gəmilərdə qaldırırdılar. *Limana* yan alan gəmi öz bayrağını *dorağacından* asırdı. Şəhər əhalisi gəminin sahibini bayrağından tanıyırdı.

Bayraqdan döyüşlərdə də istifadə edirdilər. Qoşunlar üz-üzə gələndə bayraq qaldırırdılar ki, bir-birini tanısınlar. Bayrağı ən cəsur döyüşçü – bayraqdar aparırdı. Bayraqdarı düşməndən qoruyurdular. Çünki bayrağın yerə düşməsi ordunun məğlub olması demək idi. Bəzən döyüşən tərəflərdən biri ağ bayraq qaldırırdı. Bununla da həmin tərəf bildirirdi ki, təslim olmaq və ya danışıqlar aparmaq istəyir.

Zaman keçdikcə bayraqlar xalqların, ölkələrin simvoluna çevrildi. Bu gün dünyada hər dövlətin öz bayrağı var. Bu bayraqlar rənginə və üstündəki nişanlara görə fərqlənir. Müxtəlif görüşlərdə, idman yarışlarında da bayraq qaldırırlar. Bununla da hər bir iştirakçının hansı ölkədən olduğu bilinir.

### Sözlük

***Liman*** – gəmilərin sahildə yan aldığı yer
***Dorağacı*** – gəminin ortasında dikəldilən uzun dirək

### Söz ehtiyatı

**1** Mətndə göy rəngdə verilmiş "simvol" sözünü hansı sözlə əvəz etmək olar?

A) döyüş B) qələbə C) rəmz

### Şüurlu oxu

**2** Mətndən öyrəndiyin yeni məlumatları dəftərində qeyd et. Onları əvvəl bildiklərinlə müqayisə et. Sənin üçün ən maraqlı məlumat hansı oldu?

## II MƏTN

Hər bir bayraqda rəng və işarələrin xüsusi mənası var. Azərbaycan bayrağında da belədir.

Çox qədimdə vahid türk xalqı olmuşdur. Özbək, tatar, qırğız, qazax və başqa millətlər bu xalqdan *törəmişdir.* Bayrağımızdakı mavi rəng Azərbaycan xalqının da türk *soyundan* olduğunu bildirir.

Azərbaycan bayrağının ortasındakı zolaq qırmızı rəngdədir. Bu isə müasirlik rəmzidir. Müasir olmaq ədalətli, bilikli, sülhpərvər olmaq deməkdir.

Dünyada müxtəlif dinlər var: islam, xristianlıq və s. Hər xalq bir dinə inanır. Bayrağımızdakı yaşıl rəng azərbaycanlıların islam dininə *sitayiş etdiyini* və müsəlman olduğunu göstərir.



Sözlük

***Törəmək*** – yaranmaq, əmələ gəlmək

***Soy*** – əsil-nəsəb, kök, mənşə

***Sitayiş etmək*** - dərindən hörmət etmək, inanmaq, tapınmaq

## Söz ehtiyatı

**1** Göy rəngdə verilmiş "vahid" sözünü hansı sözlə əvəz etmək olar?

A) böyük B) bir C) qədim

## Şüurlu oxu

**2** Bayraqlar haqqında mətnlərin hər birinə ad qoy.

**3** I mətndə hansı suala cavab yoxdur?

A) Nə üçün gəmilərdə bayraq qaldırırdılar?
B) Döyüşlərdə bayraqdarı niyə qoruyurdular?
C) Dəniz quldurlarının bayrağında nə təsvir olunmuşdur?

**4** II mətndə hansı suala cavab var?

A) Bayrağımızdakı qırmızı rəng nəyi ifadə edir?
B) Bayrağımızdakı səkkizguşəli ulduz nəyi ifadə edir?
C) Bayrağımızdakı aypara nəyi ifadə edir?

## Araşdırma

**5** Azərbaycan bayrağındakı nişanların mənalarını araşdır.

**6** Verilmiş məlumatları oxu və bayraqların kimə məxsus olduğunu tap.

- Yaponiyanı «Gündoğan ölkə» adlandırırlar.
- Ağcaqayın yarpağı Kanadanın simvoludur.
- Aypara rəmzindən ilk dəfə Türkiyə bayrağında istifadə edilib.
- Dəniz quldurlarının qara bayrağı hamını vahiməyə salırdı.



# ÇAHARGAH ƏFSANƏSİ

## I HİSSƏ

Qədim zamanlarda bir musiqiçi yaşayırdı. Onun mahnıları dillər əzbəri idi. Camaat bu nəğməkarı çox sevirdi, çünki o, öz nəğmələri ilə adamların sevincinə də, dərdinə də şərik olurdu.

Bir gün ölkənin padşahı musiqiçini yanına çağırıb dedi:

– Deyirlər, sən çox mahir ifaçısan. Bundan sonra mənim sarayımda yaşayacaqsan. Mənim şərəfimə mahnılar bəstələyəcəksən. Dediklərimi eləsən, qızıl içində üzəcəksən, heç nəyə ehtiyacın olmayacaq.

Padşah gözləyirdi ki, musiqiçi ona təşəkkür edib əllərindən öpəcək. Ancaq gözlədiyi kimi olmadı. Nəğməkar vüqarla dedi:

– Padşah sağ olsun, mən xalqımdan aralı düşsəm, musiqi bəstələyə bilmərəm.

Padşah bu sözlərdən qəzəbləndi. Əmr etdi ki, musiqiçini zindana salsınlar.



Düşün və cavab ver

1 Musiqiçi haqqında hansı sözü işlətmək olar?
A) məğrur B) qorxaq C) yaltaq

2 Səncə, musiqiçi padşahın hansı xahişini yerinə yetirərdi?
A) "Sabah qonşu ölkənin padşahı bizə qonaq gələcək. Onun şərəfinə bir mahnı yaz".

B) "Qonşu ölkənin padşahı bizimlə müharibəyə başlayıb. Əsgərlərimizi döyüşə ruhlandıran mahnılar yaz".

3 Yaxın mənalı sözləri müəyyən et.

| | | | |
|---|---|---|---|
| 1 | qızıl içində üzmək | A | minnətdar olmaq |
| 2 | qərq olmaq | B | zəngin yaşamaq |
| 3 | təşəkkür etmək | C | bölüşmək |
| 4 | şərik olmaq | Ç | batmaq |

## II HİSSƏ

Musiqiçinin etibarlı dostları var idi. Onlar sözü bir yerə qoydular ki, nəğməkarı zindandan xilas etsinlər. Dostlar pul gücünə keşikçini ələ aldılar. Gecənin bir yarısı musiqiçini qaçırdılar.

Bu zaman şəhərin yaxınlığından bir karvan keçirdi. Dostlar karvanbaşının yanına getdilər. Xahiş etdilər ki, musiqiçini karvanla başqa ölkəyə aparsın.

Karvan bir neçə gün səhra ilə yol getdi. Karvanbaşı gənc olduğundan karvan yolu azdı. Dəvələr hey gedir, ancaq karvan mənzil başına çatmırdı. Günəş qumu od kimi qızdırırdı. Dəvələrin boynundan asılmış zınqırovlar səhranın sükutunu pozurdu. Adamların suyu, yeməyi qurtarmış, dəvələr taqətdən düşmüşdü. Hamı ölümü gözünün altına almışdı.

Düşün və cavab ver

❹ Sənсə, dəvənin boynundan niyə zınqırov asırlar?

## III HİSSƏ

Musiqiçi karvanbaşıya yaxınlaşıb dedi:

- Belə getsə, dəvələr bu səhrada yıxılıb qalacaqlar. İcazə ver, onların zınqırovlarını dəyişim.

Karvanbaşı bu sözlərə təəccüblənsə də, icazə verdi.

Musiqiçi dəvələrin zınqırovlarını dəyişdi. Bəzilərini tarım, bəzilərini boş bağladı. Bir neçə dəvənin boynundan zınqırovu açıb başqalarına ikisini asdı.

Karvan yoluna davam etdi. Bu zaman zınqırovların səsindən ecazkar bir musiqi yarandı. Sanki ətraf aləm canlandı. Dəvələr musiqinin ahənginə uyğun olaraq gümrah yeriməyə başladılar. Adamlar susuzluğu unudub bu musiqini dinləməyə başladılar.

Bir müddətdən sonra karvan mənzil başına çatdı. Bu musiqi isə dildən-dilə düşüb "Çahargah" adı ilə məşhurlaşdı.



### Söz ehtiyatı

5 «Sözü bir yerə qoymaq» nə deməkdir?

6 «Mənzil başı» ifadəsini izah et.

### Düşün və cavab ver

7 Mətnin hansı hissələri musiqiçinin istedadlı olduğunu göstərir?

8 Sən dövlət başçısı olsaydın, istedadlı sənətkarlar – musiqiçilər, rəssamlar, şairlər üçün nə edərdin?

9 Əlamət bildirən sözlər əsərin hansı qəhrəmanlarına uyğun gəlir?

| | |
|---|---|
| təcrübəsiz | musiqiçi |
| zalım | padşah |
| istedadlı | dostlar |
| sadiq | karvanbaşı |

10 Əfsanədə baş verən hadisələrin düzgün ardıcıllığını tap və oxu.

A) Dostlar musiqiçini zindandan xilas etdilər.

B) Musiqiçi zınqırovlardan gözəl bir musiqi yaratdı.

C) Padşah musiqiçiyə əmr etdi ki, onun şərəfinə mahnı bəstələsin.

Ç) Karvan yolu azdı.

D) Musiqiçini zindana saldılar.

11 Mətnin hər bir hissəsinə ad ver.

### Dil qaydaları

12 Hansı sözdə hecalardan biri yalnız bir saitdən ibarətdir?

A) musiqiçi B) ecazkar C) karvanbaşı

QAYDALAR **HECA**

Hecalar sait səslərin hesabına yaranır. Hər hecada bir sait səs olur. Qalanları samit səslərdir. Məsələn, *şəhər* sözündə iki heca var: *şə-hər*. Birinci hecada bir sait (ə), bir samit (ş), ikinci hecada bir sait (ə), iki samit (h, r) səs var.

Bəzən hecada heç samit səs olmur. Məsələn, *ana* sözünün birinci hecasında yalnız bir sait səs (a) var: *a-na*. Hecada sait səs mütləq olmalıdır, çünki onsuz heca yaranmır.

**Unutmayın:** heca sait səsin hesabına yaranır, hər hecada yalnız bir sait səs ola bilər.

1. Hansı sözdə hecaların sayı daha çoxdur?

   A) ailə B) hökmdar C) skripka

2. Hansı söz bir hecadan ibarətdir?

   A) sait B) sirr C) arı

3. Hansı qız adında hecalardan biri yalnız bir səsdən ibarətdir?

   A) Nərminə B) Validə C) Səadət

4. Nümunəyə baxıb hecalardan sözlər düzəlt.

| | | |
|---|---|---|
| tap | rən | lək |
| qə | ra | ca |
| he | ma | yə |
| a | yə | fil |
| çi | ka | ba |

5. Hecaları düzgün ardıcıllıqla desən, sözlər yaranar.

| | | | | |
|---|---|---|---|---|
| tab – | na – | xa – | ki | ki-tab-xa-na |
| mo – | av – | bil – | to | |
| yu – | so – | cu – | du | |
| kə – | kər – | lə – | tən | |

# NOVRUZ BAYRAMI

Novruz bayramı ərəfəsində biz yaz tətilinə çıxdıq. Mən atamla kəndə, nənəmgilə getdim. Kənddəki dostlarım mənim gəlişimə çox sevindilər. Tahir dedi:

– Dünən ilaxır çərşənbə idi. Heyif ki, burada yox idin. Eybi yox, bayram axşamı bir yerdə yaxşıca əylənərik.

Martın 20-si gəlib çatdı. Bütün həyətlərdə uşaqlar tonqal qalamışdılar. Qəribədir ki, böyüklər bunu qadağan etmirdilər. Başqa vaxt deyirlər ki, odla oynamaq olmaz. İndi isə nəinki tonqal qalamağa, hətta üstündən tullanmağa da icazə verirdilər.

Tahir məni bir kənara çəkib dedi:

– Get evdən bir torba gətir. Aygüngilin qapısına torba ataq.

Mən utana-utana dedim:

– Yaxşı deyil axı... Birdən görərlər.

– Görsünlər də. Burda nə var ki?! Adətimiz belədir. Özü də Aygünün anası bilirsən nə qoğal bişirir!

Biz Aygüngilin qapısı ağzına torba qoyub gizləndik. Aygünün anası qapını açıb torbanı götürdü. Bir azdan o qayıdıb şirniyyatla dolu torbanı həmin yerə qoydu. Biz sevincək torbanı götürüb dostlarımızın yanına qaçdıq. Qoğal, doğrudan da, çox dadlı idi. Amma paxlava nənəmin paxlavasına çatmazdı.



Mən Novruz bayramını çox sevirəm, çünki bu bayramda hamı gülərüz, mehriban olur, hətta küsülülər də barışırlar.

Şüurlu oxu

**1** Mətndə Novruzla bağlı hansı adətdən ***danışılmır***?

A) Tonqal üstündən tullanmaq

B) Yumurta döyüşdürmək

C) Qapıya torba atmaq

**2** “Axır çərşənbə” ifadəsinin mənasını araşdır.

## QAYDALAR — SÖZÜN SƏTİRDƏN-SƏTRƏ KEÇİRİLMƏSİ

Yazıda söz sətrin sonuna yerləşməyəndə onun bir hissəsi yeni sətrə keçirilir. Bu zaman sözün əvvəlki hissəsinin sonunda defis (-) işarəsi qoyulur. Məsələn:

> Ana içəri girib dedi ki, çöldə bərk ya-
> ğış yağır.

Bu cümlədə *yağış* sözü sətirdən-sətrə keçirilib: *ya-ğış*.

Sözü sətirdən-sətrə düzgün keçirmək üçün sözün hecalara bölünmə qaydasını bilmək vacibdir. Lakin başqa qaydalar da var:

**1-ci qayda:** Sözün bir hərfini saxlayıb qalan hissəsini növbəti sətrə keçirmək olmaz.

~~a-ilə~~ ai-lə

**2-ci qayda:** Sözdən bir hərfi ayırıb növbəti sətrə keçirmək olmaz.

~~təbi-i~~ tə-bii

**1** Hansı sözü sətirdən-sətrə keçirmək olmaz?

A) işıq B) dairə C) nail

**2** "Etibar" sözünü sətirdən-sətrə necə keçirmək olar?

A) e-ti-bar B) eti-bar C) et-ib-ar

**3** Mətndə hansı sözlər sətirdən-sətrə düzgün keçirilməyib?

> Bir dəfə pişik siçanı aldatmaq fikrinə düşdü. O-
> na dedi ki, yuvandan çıxıb o biri yuvaya girsən, sə-
> nə istədiyin yeməyi verərəm. Siçan fikirləşdi ki, as-
> an bir işdən ötrü bu qədər hədiyyə verilirsə, bur-
> ada bir kələk var. Ona görə də razılıq vermədi.

# ƏBƏDİ MƏŞƏL

Əhmədin babası Digah kəndində yaşayır. Bu kənd Bakının yaxınlığındadır. Balaca Əhməd tez-tez babasıgilə qonaq gəlir. Bir dəfə babası onu yaxındakı təpələrə gəzməyə apardı. Onlar «Yanardağ» deyilən yerə gəlib çıxdılar. Burada yerdən alov çıxırdı. Bunu görən Əhməd babasından soruşdu:

- Baba, bu odu kim yandırıb?

Baba gülümsündü:

- Heç kim, bala. Yerin altından çıxan qaz öz-özünə alışıb yanır. Azərbaycan torpağı çox zəngindir. Yerin altı da, üstü də qızıldır.

Əhməd bir az düşünüb dedi:

- Baba, atam məni «Şəhidlər xiyabanı»na aparmışdı. Mən orada da alov gördüm. Oradan da qaz çıxır?

- Yox, oğlum, o məşəl Vətən uğrunda həlak olanların xatirəsinə alovlanır. Bax, burada qaz qurtaranda alov sönə bilər. Amma «Əbədi məşəl»i insanlar heç vaxt sönməyə qoymurlar. O, həmişə yanır ki, qəhrəmanlarımızın xatirəsi xalqın yaddaşında daim yaşasın.



Düşün və cavab ver

- Azərbaycana niyə "Odlar yurdu" deyirlər?

# VƏTƏN

Ey Vətən, ana Vətən
Heyranam sənə, Vətən!
Dupduru göllərin var,
Yamyaşıl çöllərin var.
Dağların baş-başadır,
Düzlərin tamaşadır.
Dərələrin dərindir,
Yaylaqların sərindir.
Nə gözəldir qucağın,
Doğma odun-ocağın!

Kəntlərin gül-çiçəkdir,
Şəhərlərin göyçəkdir.
Sakitdir gen düzlərin,
Coşqundur dənizlərin.
Sən dünyanın gözüsən,
Taleyimin özüsən.
Sevirəm bayrağımı,
Öpürəm torpağımı!

*Əhməd Cəmil*

## Düşün və cavab ver

1. «Vətən» dedikdə ilk növbədə nə haqda düşünürsən?
2. "Əbədi məşəl" hekayəsi ilə "Vətən" şeirinin məzmununda hansı oxşar və fərqli cəhətlər var?
3. «Əbədi məşəl» mətnindəki "Yerin altı da, üstü də qızıldır" ifadəsi hansı mənada işlənib?

## Dil qaydaları

**4** "Vətən" şeirindəki qırmızı rəngdə verilmiş sözdə hansı səhv buraxılıb?

**5** Mavi rəngdə verilmiş hansı söz yazıldığı kimi deyilmir?

**6** Hansı söz həm ad, həm əlamət, həm də hərəkət bildirir?
A) dağ B) dərə C) düz

**7** «Göyçək» sözünü bu sözlərdən hansına aid etmək olar?
A) şəhər B) qız C) dağ

## Söz ehtiyatı

**8** «Şəhərlərin göyçəkdir» ifadəsində «göyçəkdir» sözünü hansı sözlə əvəz etmək olar? Şair burada niyə məhz «göyçəkdir» sözünü işlətmişdir?

**9** Lüğətin köməyi ilə «şəhid» və "xiyaban" sözlərinin mənalarını araşdır.

**10** Əks mənalı sözləri müəyyən et.

| | | | |
|---|---|---|---|
| 1 | əbədi | A | qürbət |
| 2 | yanmaq | B | çirkin |
| 3 | vətən | C | sönmək |
| 4 | aparmaq | Ç | müvəqqəti |
| 5 | zəngin | D | gətirmək |
| 6 | göyçək | E | yoxsul |

## Məntiq

**11** Nöqtələrin yerinə hansı sözlər olmalıdır?

| | |
|---|---|
| duru | dupduru |
| yaşıl | yamyaşıl |
| düz | ... |
| qara | ... |
| sarı | ... |

## QAYDALAR — HƏRFLƏRİN ƏLİFBA SIRASI

Əlifba hərfləri və onların ardıcıllığını əks etdirir.

Əlifbamızda 32 hərf var. Onlardan 9-u sait, 23-ü samit səsləri bildirir.

Saitlər: A a, E e, Ə ə, I ı, İ i, O o, Ö ö, U u, Ü ü

Samitlər: B b, C c, Ç ç, D d, F f, G g, Ğ ğ, H h,
X x, J j, K k, Q q, L l, M m, N n,
P p, R r, S s, Ş ş, T t, V v, Y y, Z z.

Hərflərin əlifba sırasını əzbər bilmək vacibdir. Bu bilik həyatda adama tez-tez lazım olur. Məsələn, telefon kitabçasında adları əlifba sırası ilə yazırlar. Bu zaman istənilən nömrəni tez tapmaq olar. Əks halda bir nömrə axtaranda bütün kitabçanı başdan-ayağa vərəqləmək lazım gəlir.

**1** Nöqtələrin yerinə hansı hərflər olmalıdır?

A, ..., C, Ç, D, ..., Ə, F, ..., Ğ, H, ..., I, ..., J, K, Q, L, M, ..., O, Ö, ..., R, S, ..., T, U, Ü, ..., Y, Z

**2** *İlqar, Azad, Ləman, Dilbər* adlarını əlifba sırası ilə düzsən, onların baş hərflərindən hansı ad alınar?

**3** Əlifba haqqında deyilənlərdən hansı səhvdir?

A) Əlifba hərflərin müəyyən sıra ilə düzülüşüdür.
B) Əlifbada əvvəlcə saitlər, sonra samitlər gəlir.
C) Əlifbadakı 32 hərfdən 9-u sait, 23-ü samit səsləri bildirir.

**4** **Məntiq.** ***Əli, İmran, Nərgiz, Zəhra, ...***
Hansı adlar bu ardıcıllığı davam etdirə bilər?

A) Aynur, Ramiz
B) Tural, Nigar
C) Günel, Leyla

# AZƏRBAYCAN ƏLİFBASI

Qədimdə insanlar yaza bilmirdilər. Onlar fikirlərini bir-birinə danışmaqla çatdırırdılar. Sonra hər danışıq səsini bir hərflə işarə etdilər. Bu hərflərin köməyi ilə sözlər, cümlələr yazmağa başladılar. Beləliklə, əlifba, yəni hərflər toplusu yarandı.

Müasir Azərbaycan əlifbası latın qrafikalı əlifba adlanır. Dünyanın bir çox xalqları qədim latın əlifbasından istifadə edir. Lakin hər xalqın dilində özünəməxsus səslər və bu səslərə uyğun hərflər var. Ona görə də hər xalqın əlifbası fərqlidir.

Azərbaycanda hər il avqustun biri əlifba və dil bayramı kimi qeyd edilir. Ulu *öndər* Heydər Əliyev 2001-ci ildə bu barədə xüsusi fərman imzalamışdır.

Sözlük

***Öndər*** — başçı, lider

Şüurlu oxu

1 "Azərbaycan əlifbası" mətnində hansı suala cavab var?

A) Əlifbamızda neçə hərf var?

B) Azərbaycanda latın əlifbasına keçid nə zaman baş verib?

C) Əlifbalar niyə fərqlidir?

Düşün və cavab ver

2 Niyə bütün xalqlar eyni əlifbadan istifadə etmirlər?

3 Hansı əvvəl yaranmışdır – səs, yoxsa hərf?

Araşdırma

4 Müəllimin köməyi ilə ana dilimizdə və xarici dildə olan fərqli səsləri müqayisə edin.

# RƏNGLƏRİN ANASI

Necə oldusa, uşaqlar arasında rənglərdən söhbət düşdü. Biri yaşılı, digəri mavini, o birisi qırmızını təriflədi. Sarını, göyü bəyənənlər də az olmadı. Nə isə... Mübahisə çox uzandı. Nəhayət, uşaqlar qoca bağbanın yanına getdilər.

– Baba, ən yaxşı rəng hansıdır? – deyə ondan soruşdular.

Bağban fikrə getdi. Nəhayət, sözə başladı:

– Balalarım, hamınız haqlısınız. Hər rəngin öz yeri, öz gözəlliyi var. Ancaq mənə qalsa, rənglərin ən gözəli qaradır.

Uşaqlar təəccübləndilər:

– Necə, necə?

Baba gülümsündü:

– Bu qara torpağı görürsünüzmü? Onun sehrli *köksündə* nə rəngdə istəsən, gül-çiçək bitir. Elə buna görə də qara bütün rənglərin anasıdır.

*Rafiq Yusifoğlu*



## Sözlük

***Köks*** – sinə

## Düşün və cavab ver

**1** Hansı fikir mətnin məzmununa uyğun gəlmir?
A) Hər rəngin öz gözəlliyi var.
B) Rənglərin də yaxşısı, pisi olur.
C) Torpağa sevgi ilə yanaşmaq lazımdır.

**2** Hansı rənglərin adları bitki adından götürülmüşdür?
*şabalıdı, palıdı, qızılı, narıncı, gümüşü, bənövşəyi, qırmızı*

## Məntiq

**3** Nöqtələrin yerinə hansı sözlər uyğun gəlir?

| I | II |
|---|---|
| qırmızı — çəhrayı | Qıpqırmızı qızardı. |
| qara — boz | ... qaraldı. |
| göy — ... | Gömgöy ... |

**4** Boş xanalarda hansı rənglərin adları olmalıdır?

| | |
|---|---|
| sarı + çəhrayı → | qırmızı |
| mavi + çəhrayı → | |
| mavi + sarı → | |

## Cütləri müəyyən et

**5** Rəng adları hansı əşya adlarına uyğun gəlir?

| | |
|---|---|
| mavi | limon |
| qırmızı | xiyar |
| sarı | səma |
| yaşıl | qar |
| bənövşəyi | pomidor |
| ağ | badımcan |

QAYDALAR **LÜĞƏTDƏN İSTİFADƏ**

Dilimizdə sözlərin sayı çoxdur. Onların düzgün yazılışını və mənasını bilmək vacibdir. Bunun üçün lüğətlərdən istifadə etmək lazım gəlir.

Sözlərin düzgün ***yazılışını*** göstərən lüğətə **orfoqrafiya lüğəti** deyilir. Sözlərin ***mənalarını*** göstərən lüğət isə **izahlı lüğət** adlanır.

Bəs bu qədər söz arasında lazım olanı necə tapmaq olar? Bu yerdə əlifba sırası köməyə gəlir. Lüğətlərdə sözlər əlifba sırası ilə düzülür. Bu isə lazım olan sözü tez tapmağa kömək edir.

1. Azərbaycanın şəhər adlarını əlifba sırasına uyğun düz.
   *Gəncə, Bakı, Sumqayıt, Naxçıvan, Mingəçevir*

2. *Minayə, Məleykə, Mahirə, Müslüm, Məlik* adlarının hamısı «m» hərfi ilə başlanır. Onları əlifba sırası ilə necə düzərsən?

3. Aşağıdakı sözlərin yazılışını lüğət vasitəsilə dəqiqləşdir:

| | |
|---|---|
| balış *yoxsa* balınc | xahiş *yoxsa* xayiş |
| açar *yoxsa* haçar | morux *yoxsa* moruq |
| sahat *yoxsa* saat | qəşəng *yoxsa* qəşənk |
| axıllı *yoxsa* ağıllı | kainat *yoxsa* kayinat |

4. Lüğətdə «xala» sözü hansı sözlə yanaşı ola bilər?
   A) bibi B) xalça C) dayı

5. Adlar hansı bənddə əlifba sırası ilə düzülüb?

   A) Kamil, Kamran, Kəmalə, Natiq, Nərminə
   B) Kəmalə, Nərminə, Natiq, Kamil, Kamran
   C) Natiq, Nərminə, Kamil, Kamran, Kəmalə

# QƏDİM XALÇA

Gülər birinci sinfi bitirəndə nənəsi ona bir xalça bağışladı. Balaca qız nənəsinə təşəkkür etsə də, bu hədiyyəyə o qədər də sevinmədi. Çünki xalça köhnə idi. Gülər onu öz otağına yaraşdırmırdı. Nənə bunu hiss edib nəvəsinə xalçanın tarixini danışdı:

«Bu xalçanı mənim nənəmin nənəsi toxuyub. Onun adı Sayalı idi. Şuşanın ən mahir xalçaçılarından sayılırdı. Evləri də xalqımızın böyük şairi Xurşidbanu Natəvanın qonşuluğunda idi. Şuşada Natəvanı hamı "Xan qızı" deyə çağırırdı.

Bir gün Sayalı həyətdə hana qurub xalça toxumağa hazırlaşır. Bu zaman Xan qızı onu görüb yanına gəlir. Hanadakı əlvan rəngli iplərə baxıb heyran olur. Qız utana-utana deyir:

— Bu boyalar dağlarımızın çiçəklərindən, otlarından hazırlanıb.

— Çox gözəldir. Gəl mən bir çeşni çəkim. Onu xalçaya sal.

Hə, Gülər bala, onu da deyim ki, Xan qızı təkcə şair deyildi, həm də yaxşı rəssam idi. Xalçada gördüyün bax bu çeşniləri o çəkib. Odur ki, qızım, bu xalça doğma Şuşamızdan, gözəl şairimiz Natəvandan xatirədir».

Bu söhbətdən sonra Gülər evlərinə gələn qonaqlara xalçanın tarixini danışaraq qürurla deyir:

— Onu mənim nənəmin nənəsinin nənəsi toxuyub.



Sözlük

***Hana*** — xalça toxumaq üçün dəzgah
***Çeşni*** — xalça naxışı

Araşdırma

Evinizdəki qədim əşyaların tarixçəsini öyrənib danışın.

1. Hansı cümlələr doğru, hansıları yanlışdır?
   - Mən eşitdiyim hərfləri bir-bir təkrar etdim.
   - Müəllim bizə səslərin düzgün tələffüzünü öyrətdi.
   - Tural sözdəki səslərdən birini səhv yazmışdı.
   - Kiçik qardaşım bu hərfi deməyə çətinlik çəkir.
   - Mən lövhədə yazılmış hərfləri pis görürdüm.

2. Sözlərdə işarələnmiş hərfi dəyişərək yeni sözlər düzəlt.

| | | |
|---|---|---|
| nənə – nəvə | toyuq – | bir – |
| ata – | ət – | qaz – |
| məktəb – | qar – | baş – |

3. Hansı sırada nöqtələrin yerinə eyni hərf yazılmalıdır?
   A) qana..., kən..., mana...
   B) ta...ta, xa...iş, şa...ta
   C) nö..tə, mə...səd, qoça...

4. Hansı sözdə samitlərin sayı ilə saitlərin sayı arasındakı fərq daha çoxdur?
   A) nağıl
   B) sentyabr
   C) dostluq

5. Sözün içindəki sözləri tap.

| | |
|---|---|
| qatar – qat, at, ata, tar | istifadə – |
| canavar – | çarpayı – |
| gilənar – | televizor – |

6. Nöqtələrin yerinə hansı hərfləri əlavə etsən, əlifba sırası pozulmaz? *C, Ç, D, ...., ...., ...., G, Ğ, H*
   A) B, E, K
   B) E, Ə, F
   C) I, İ, C

7. Hansı atalar sözündə müəllimə hörmətdən bəhs olunur?
   A) Ağıl yaşda deyil, başdadır.
   B) Ustadına kəc baxanın gözlərinə qan damar.

BÖLMƏ
2

# AİLƏ

- Sözlərin deyilişi və yazılışı
- Saitlərin deyilişi və yazılışı
- Samitlərin deyilişi və yazılışı
- "K" samitinin tələffüzü



# ÜÇ BACI

Ana qızları ilə bazara getmişdi. Bir dükanın qarşısında dayandılar. Ana dedi:

– Saçımı daramağa bir daraq alım.

Qızlar tez dilləndilər:

– Üç balaca daraq da bizə al.

Ana dedi:

– Darağımı, güzgümü qoymağa bir çanta alım.

Qızlar dedilər:

– Üç dənə balacasını da bizə al.

Ana dedi:

– Döşəməni silməyə bir şotka alım.

Qızların heç birindən səs çıxmadı.

## Düşün və cavab ver

1. Ana şotka almaq istəyəndə qızlar niyə susdular?
2. Ananın qızları haqqında nə demək olar?

   A) lovğadırlar
   B) tənbəldirlər
   C) dəcəldirlər
3. Siz ev işlərində ananıza kömək edirsinizmi?

## Dil qaydaları

4. "Daraq" sözünün sonunda hansı səs tələffüz olunur?



# İKİ ALMA

Tofiq hesab dəftərini anasına göstərib soruşdu:

- Anacan, bax gör məsələni düz həll eləmişəm?

Ana onun dəftərinə baxıb dedi:

- Yox, oğlum, səhvdir, iki alma çatmır. Yaxşı fikirləş, yoxsa pis qiymət alarsan.

Səhər ana Tofiqi məktəbə, Sevdanı bağçaya yola salanda hərəsinə bir qırmızı alma verdi.

Axşam dərsdən qayıdanda Tofiq anasına dedi:

- Anacan, səhər sən mənə bir alma vermişdin. Ancaq məktəbdə çantanı açanda gördüm ki, orada iki alma var. Bu, necə ola bilər?

Birdən Sevda dilləndi:

- O biri almanı çantaya mən qoymuşam.

Ana təəccüblə soruşdu:

- Niyə, qızım, sən ki almanı çox xoşlayırsan?

- Xoşlayıram. Amma almanı verməsəydim, Tofiq pis qiymət alardı axı!

Ana ilə Tofiq bir-birinin üzünə baxıb ucadan güldülər. Sonra ana Sevdanı qucağına alıb öpdü və dedi:

- Ay mənim mehriban, qayğıkeş qızım!

*İsa Hümmətov*



Şüurlu oxu

1. Mətnlə şəkil arasında hansı uyğunsuzluq var?

Düşün və cavab ver

2. Ana ilə Tofiq Sevdanın sözlərinə niyə güldülər?
3. Ana niyə Sevdanı mehriban, qayğıkeş adlandırdı?
4. Hansı sözdə «ğ» samiti «x» kimi tələffüz olunur?

   A) oğlum  B) boğça  C) qayğıkeş

QAYDALAR

## SÖZLƏRİN DEYİLİŞİ VƏ YAZILIŞI

Elə sözlər var ki, deyildiyi kimi yazılmır. Məsələn, biz «uşaq» yazırıq, amma «uşax» deyirik. Belə sözlərə yazılışı və tələffüzü fərqlənən sözlər deyilir.

**Unutmayın:** belə sözləri yazıldığı kimi demək və ya deyildiyi kimi yazmaq olmaz.

### Tətbiqetmə

1 Hansı sütunlarda sözlər səhv yazılıb?

| I | II | III | IV |
|---|---|---|---|
| ehtiyyat | təyyarə | səyahət | məksəd |
| düşpərə | aşpaz | pəhləvan | qarmax |
| camahat | dovğa | həyəcan | kiprik |

2 Sözlərdən birində «d» yazılır, «t» deyilir.

A) daban B) səda C) polad

3 Hansı sözdə ***sait*** səslərdən biri yazıldığı kimi tələffüz olunmur?

A) pomidor B) saqqal C) sual



4 Şəkildəki heyvanın adı hansı bənddə düzgün yazılıb?

A) douşan B) dovşan C) doşan



5 Şəkildəki heyvanın adı hansı bənddə düzgün yazılıb?

A) pələng B) pələnk C) pələk

6 Sözlərdən birini deyəndə iki sait səsin arasına "y" samiti əlavə olunur:

A) şüar B) səadət C) təbiət

# ŞAM

Şam şəkli çəkib
Kiçik Yasəmən,
Qoydu qarşıma,
Dedi: – Görürsən?!

Söylədim: – Şamın
Qəşəngdir, qəşəng.
Ancaq sən onu
Yana-yana çək.

Düşünüb bir az
Dedi Yasəmən:
– Qorxuram vərəq
Alışa birdən.

*Mir Sabir*



Düşün və cavab ver

**1** "Şam" şeiri ilə aşağıda verilmiş şeirin məzmunundakı oxşarlığı izah et.

## HASARDAKI QUŞLAR

T...başir tapıb bir az,
Həyətə çıxdı Solmaz.
Tax...a hasarın üstə
Quş çəkdi dəstə-dəstə.
Bir azdan göy tutuldu.
Yağış yağdı o qədər...
Hasarın üstdən daha
Quşlar uçub getdilər.



Dil qaydaları

**2** Göy rəngdə verilmiş sözlərdə nöqtələrin yerinə hansı hərflər yazılmalıdır?

A) a, t  B) ə, t  C) ə, d

# VASİFİN GÜNDƏLİYİ

Sözlük

**Gündəlik** – 1. Evə verilmiş tapşırıqların və alınmış qiymətlərin qeyd olunduğu şagird dəftəri.
2. Hadisə, müşahidə və düşüncələrin qeyd olunduğu dəftər.

26 fevral. Dərslərimi hazırlayanda kiçik qardaşım Toğrul həmişə mənə mane olur. İstəyir ki, onunla oynayım. Ancaq Toğrulla oynamaq mənim üçün maraqsızdır.

Bu gün Toğrul yenə mənə yaxınlaşanda üstünə qışqırdım. Əlimdəki dəftərlə onu vurdum. Toğrul ağladı. Atam bunu görüb başını buladı.



Düşün və cavab ver

**1** Vasifin kiçik qardaşına qarşı kobudluğuna haqq qazandırmaq olarmı?

27 fevral. Atamla parka gəzməyə çıxmışdıq. Çəmənlikdəki skamyada oturub söhbət edirdik. Otluqda yekəpər bir it uzanmışdı. Birdən balaca bir it hürə-hürə ona yaxınlaşdı. Yekəpər it tənbəl-tənbəl başını çevirib ona baxdı, ancaq yerindən tərpənmədi. Küçük hürə-hürə onun dörd tərəfinə fırlanırdı. Bəzən hətta pəncəsini onun quyruğuna, belinə toxundururdu. Yekəpər it isə tərpənmək bilmirdi ki, bilmirdi. Hərdən balaca it çox yaxınlaşanda o, yekə pəncəsi ilə küçüyü ehmalca kənara itələyirdi.



Mən atama dedim:

– Bu boyda it balaca bir küçüyün şıltaqlığına necə dözür? Axı istəsə, bir pəncəsi ilə onu əzə bilər.

– Elədir, oğlum, ancaq böyüklər və güclülər kiçiklərə və zəiflərə qarşı həmişə dözümlü olmalıdırlar. Sən də çalışmalısan ki, öz kiçik qardaşınla mehriban rəftar edəsən. Axı o, balacadır, hələ çox şeyi başa düşmür.

Atamın bu sözlərindən sonra Toğrulla kobud davranmağım yadıma düşdü. Çox utandım, qərara gəldim ki, bu gündən qardaşımla mehriban olum.

### Düşün və cavab ver

**2** Göy rəngdə verilmiş "dözümlü" sözünü hansı sözlə əvəz etmək olar?

A) sədaqətli B) səbirli C) mehriban

### Dil qaydaları

**3** Sözlərdən birində "t" samiti "d" kimi tələffüz olunur:

A) Toğrul B) kitab C) dəftər

# SEHRLİ TORBA

## I hissə

Səməd kənddə ən nadinc oğlan idi. Onun əlindən hamı təngə gəlmişdi. Bir adam yox idi ki, Səməd haqqında yaxşı söz desin.

Bir gün Eldar baba onu yanına çağırıb dedi:

– Səməd, istəyirsən elə edim ki, heç kim səni danlamasın?

– Heç kim? Heç vaxt? – deyə Səməd təəccübləndi. – Əlbəttə, istəyirəm.

– Onda bir şərtim var. Bu kisəni görürsən? Gərək onu xırda daşlarla doldurasan. Kisə dolandan sonra nə istəsən, edə bilərsən. Söz verirəm ki, heç kim səni danlamayacaq.

– Elə bu? Doğru deyirsən? Mən razı! Ver torbanı.

– Hə, lap yadımdan çıxmışdı. Sən bu kisəyə o vaxt daş ata bilərsən ki, bir xeyirxah iş görəsən. Birinə yaxşılıq etdin – bir daş, kömək etdin – bir daş. Ta kisə dolana qədər. Razısan?

Səməd bir az düşünüb razılaşdı. Baba kisəni həyətdəki ağacın budağından asdı.



Düşün və cavab ver

1. Sənçə, Eldar baba Səmədi aldadır, yoxsa doğru deyir?
2. Səmədin yerinə olsaydın, bundan sonra nə edərdin?
3. Sən müəllifin yerinə olsaydın, hekayəni necə davam etdirərdin?

## II hissə

Günlər keçir, Səməd hər gün kəndi dolaşır, biri üçün odun yarır, başqasına su daşıyır, yaşlılara kömək edir və hər əməlindən sonra kisəyə daş atırdı. Hər dəfə də torbanın içinə baxır, səbirsizliklə onun dolmasını gözləyirdi.

Beləliklə, bir ay ötüb keçdi. Bir gün Səməd gördü ki, kisə artıq dolub.

O, sevinclə babasını çağırıb dedi:

– Baba, mən sən deyəni elədim. İndi nə istəsəm, edə bilərəm?

– Əlbəttə!

– Məni heç kim danlamaz ki?

– Yox, mənim balam, daha səni heç kim danlamayacaq.





Düşün və cavab ver

4 Səncə, Səməd bundan sonra pis əməllərinə qayıdacaqmı?

## III HİSSƏ

Səməd sevincək həyətdən çıxdı. Qonşuluqda Telli xala əyilib aşmış taxta çəpəri düzəldirdi. Səməd qaça-qaça gəlib çəpərə bir təpik vurmaq istəyirdi ki, birdən dayandı:

– Qoy bu gün də Telli xalaya kömək edim, sabahdan istədiyimi edərəm, – deyə fikirləşdi.

Beləcə günlər keçdi. Amma Səməd bir daha pislik, nadinclik edə bilmədi. İndi kənddə heç kim onu danlamır.



Düşün və cavab ver

5 Doğrudanmı, Eldar babanın torbası sehrli idi? Əgər belə deyilsə, səncə, Səmədin xasiyyətini dəyişdirən nə oldu?

QAYDALAR

## SAİTLƏRİN DEYİLİŞİ VƏ YAZILIŞI

Bəzi sözlərdə yazılan "o" saiti danışıqda "a" kimi tələffüz olunur. Məsələn:

*kalbasa* deyirik, *kolbasa* yazırıq.

Sözdə iki sait yanaşı gələndə də çox vaxt həmin söz deyildiyi kimi yazılmır. Bəzən bu iki saitin arasında bir samit tələffüz olunur. Məsələn:

*ayilə* deyirik, *ailə* yazırıq.

Bəzən isə yanaşı gələn saitlərdən biri tələffüz olunmur. Məsələn:

*məllim* deyirik, *müəllim* yazırıq.

1. Hansı sözün yazılışında səhvə yol verilib?
   A) maarif  B) camahat  C) dairə

2. Hansı sözdə saitlərdən biri tələffüz olunmur?
   A) müəssisə  B) daimi  C) təbiət

3. Sözlərdən birində "o" yazılır, "a" deyilir.
   A) qoğal  B) kollektiv  C) kartof

4. Sözlərdən birində "y" samiti yazılmamalıdır.
   A) qənayət  B) saniyə  C) kinayə

5. Hansı sözdə bir "ə" hərfi artıq yazılıb?
   A) mənfəət  B) təəccüb  C) təərif

6. Hansı sözdə ***saitlərdən*** biri düzgün yazılmayıb?
   A) taxda  B) mübarizə  C) qəhraman

7. Hansı sözdə bir sait buraxılıb?
   Həkim xəstəni malicə etdi.

# YAŞIL FİNCAN

Bir dəfə ana evə gələndə gördü ki, onun sevimli yaşıl fincanı qırılıb. Evdə isə təkcə Murad, bir də Məstan adlı pişik var idi.

Ana soruşdu:

– Fincanı kim sındırıb?

Murad çiyinlərini çəkdi:

– Aha, deməli, Məstan sındırıb.

Ana daha heç nə demədi. Məstanı çölə ötürüb qapını örtdü.

– Ana, çöl soyuqdur axı, Məstan üşüyər, – Murad dilləndi.

– Eybi yoxdur, qoy başa düşsün ki, qabları sındırmaq olmaz.

Ana öz işi ilə məşğul olmağa başladı. Pişiyi də, Muradı da unutdu. Bir azdan gördü ki, pişik evdə gəzir, amma Murad yoxdur. Aydındır ki, pişiyi evə Murad buraxmışdı. Ana onu evdə xeyli axtardı, tapa bilmədi. Axırda qapını açıb çölə çıxdı. Murad bayırda idi. Soyuqdan tir-tir əsirdi.

– Sən burada neyləyirsən? – deyə ana həyəcanla Muraddan soruşdu.

Murad başını aşağı salıb titrəyə-titrəyə dedi:

– Fincanı mən sındırmışdım.



## Sözlük

***Etiraf etmək*** – öz səhvini boynuna almaq

## Doğru, yoxsa yanlış

1. Anası fincanı kimin sındırdığını soruşduqda:
   A) Murad anasını aldatdı.
   B) Murad anasından həqiqəti gizlətdi.
2. Murad özünü cəzalandırdı, çünki:
   A) qorxdu ki, Məstan həqiqəti açıb söyləyər.
   B) vicdanı yol vermədi ki, Məstan günahsız yerə cəzalansın.

## Düşün və cavab ver

3. Mətnin məzmununa uyğun gələn atalar sözlərini seç.
   - Yalan üz qaraldır.
   - Yalançının şahidi yanında olar.
   - Yalanın ömrü az olar.
   - Yalançı özünün düşmənidir.
   - Yalan cücərər, amma bitməz.
4. Hansı daha pis əməldir: yalan söyləmək, yoxsa həqiqəti gizlətmək?
5. Mətni davam etdir. Səncə, Muradın etirafından sonra ana ona nə dedi?
6. Müəllifin yerinə olsaydın, mətnə hansı adı qoyardın?
   A) Muradın etirafı
   B) Məstanın sədaqəti
   C) Muradın yalanı

## Dil qaydaları

7. Nəyə görə mətndə "pişik" kiçik, "Məstan" isə böyük hərflə yazılıb?
8. "Məstan" sözündə hansı samit yazıldığı kimi deyilmir?

# DOSTUM LƏTİF

Mən Bakıdakı 158 nömrəli məktəbin 2-ci[b] sinfində oxuyuram. Sinifdə ən yaxın dostum Lətifdir. Əvvəllər Lətifgilin ailəsi Gədəbəyin Poladlı kəndində yaşayırdı. Amma iki il bundan əvvəl onlar Bakıya köçdülər. İndi bizim qonşumuzdurlar. Lətifin atası Eyvaz əmi mühəndisdir, neft şirkətində işləyir. Anası Çiçək xala isə məktəbimizdə kitabxanaçıdır. Lətifin qardaşı Toğrul da bizim məktəbdə, 4-cü sinifdə oxuyur.

Mənim nənəm Lətifi çox istəyir. Eşidəndə ki, Lətif bilik yarışmasında birinci yerə çıxıb, nənəmin ona hörməti daha da artdı. Bir dəfə Lətif bizə gələndə nənəm ona dedi:

– Yaxşı oxuyan uşaqlar gözümün işığıdır. De görüm, ad günün nə vaxtdır? Bu qoca nənən sənə qəşəng bir hədiyyə alsın.

Lətif bir az qızardı. Sonra yavaşca dedi:

– Mənim ad günüm Respublika Gününə düşür. Ona görə də bizim evdə ikiqat bayram olur.

Nənəm gülümsünüb dedi:

– Təki bütün balalarımız sənin kimi tərbiyəli, ağıllı olsun. Oğlum, bir de görüm, sən öz adının mənasını bilirsən?

Lətif bir az düşünüb cavab verdi:

– Yox, amma bilirəm ki, atam mənə öz atasının adını qoyub. Ona da vaxtilə babasının adını qoyublar. Elə soyadımız da həmin ulu babamın adı ilə bağlıdır. Qardaşıma da ana babamın adını qoyublar. Deyirlər, belə yaxşıdır.

– Düz deyirlər, bala, nəsildə adlar yaşamalıdır, – deyə nənəm Lətifin başını sığalladı.



Sözlük

***Təvəllüd*** – anadan olma, doğum tarixi
***Anket*** – qabaqcadan hazırlanmış suallara cavab vermək üçün vərəqə

Lətifin anketində buraxılmış səhvləri tap.

## ŞAGİRD ANKETİ



| Adı | Soyadı | Atasının adı |
|---|---|---|
| Lətif | Eyvazlı | Eyvaz oğlu |

Təvəllüdü: 28 may 2001-ci il

Doğulduğu yer: Gədəbəy rayonu, Poladlı kəndi

Milliyyəti: azərbaycanlı

Təhsil aldığı məktəb: Bakı şəhəri, 158 nömrəli məktəb

Sinif: 2b

Təhsildə uğurları: Məktəb üzrə bilik yarışmasında 1-ci yerə layiq görülmüşdür.

### AİLƏ TƏRKİBİ HAQQINDA MƏLUMAT

**Atası**

| *Adı* | *Soyadı* | *Atasının adı* |
|---|---|---|
| Eyvaz | Eyvazlı | Lətif |

| İş yeri | Vəzifəsi |
|---|---|
| Neft şirkəti | mühasib |

**Anası**

| *Adı* | *Soyadı* | *Atasının adı* |
|---|---|---|
| Çiçək | Eyvazlı | Kamil |

| İş yeri | Vəzifəsi |
|---|---|
| Bakı şəhəri, 158 nömrəli məktəb | kitabxanaçı |

### Bacı və qardaşları

| | Adı | Yaşı | Təhsil aldığı məktəb, sinif |
|---|---|---|---|
| 1. | Toğrul | 10 | 158 nömrəli məktəb, 6-cı sinif |

QAYDALAR **SAMİTLƏRİN DEYİLİŞİ VƏ YAZILIŞI**

Sözün sonunda gələn samitlər çox zaman deyildiyi kimi yazılmır. Məsələn:

*kənt* deyirik, *kənd* yazırıq;
*ocax* deyirik, *ocaq* yazırıq.

Sözdə samitlər yanaşı gələndə də çox vaxt onlardan biri fərqli tələffüz olunur. Məsələn:

*məksəd* deyirik, *məqsəd* yazırıq;
*şafdalı* deyirik, *şaftalı* yazırıq.

**1** Nöqtələrin yerinə hansı hərf yazılmalıdır?

ba...ça *ğ, yoxsa x*
bit...i *k, yoxsa g*
to...qa *q, yoxsa k*

**2** Hansı sırada nöqtələrin yerinə eyni hərf yazılmalıdır?

A) qana..., sədaqə..., mana...
B) seç...i, əs...ər, ...übrə
C) nö..tə, mə...səd, tə...sir

**3** Sözlərdən birində "q" samiti fərqli tələffüz olunur:

A) əxlaq B) aşıq C) aşiq

**4** Hansı sözün sonunda "d" yazılmalıdır?

A) alə... B) kən... C) xala...

**5** Bir sözdə nöqtələrin yerinə "m" hərfi yazılmalıdır:

A) şə...bə B) tə...bəl C) kö...bə

**6** Sözlərdən birində "t" samiti tələffüz olunmur:

A) neftçi B) oktyabr C) xətkeş

**7** "Sənət" kimi tələffüz etdiyimiz söz necə yazılmalıdır ki:

– "peşə" mənasını versin?
– "rəsmi kağız" mənasını versin?

# NƏ DAHA YAXŞIDIR?

Bir balaca qız anasına sual verməyi çox sevirdi:

– Ana, hansı daha yaxşıdır: alma, yoxsa armud? Qızılgül, yoxsa çobanyastığı? Su, yoxsa şirə? Top, yoxsa gəlincik?

Ana böyük səbirlə cavab versə də, getdikcə səbri tükənirdi. Axı, doğrudan da, necə demək olar hansı yaxşıdır: top, yoxsa gəlincik.

Bir dəfə qız yenə soruşdu:

– Ana, mahnı yaxşıdır, yoxsa nağıl?

Ana dedi:

– Əvvəl sən mənə de görüm, səma yaxşıdır, yoxsa günəş? Sonra mən sənin sualına cavab verərəm.

Qız çox düşündü. Açıq səmaya da baxdı, parlaq günəşə də. Hər ikisi gözəl, bir-birindən ayrılmaz idi. Ona görə də heç nə deyə bilmədi.

Bundan sonra daha qız soruşmurdu ki, nə yaxşıdır. Soruşurdu ki, nağılı niyə sevirlər? Mahnının nəyi yaxşıdır? Ana da böyük həvəslə onun suallarına cavab verirdi.



Düşün və cavab ver

**1** Hekayədən hansı nəticəni çıxarmaq olar?

A) Hər sualın bir cavabı var.

B) Hər bir sualın cavabını kitablarda axtarmaq lazımdır.

C) Tamamilə pis və ya tamamilə yaxşı heç nə yoxdur. Hər şeyin öz gözəlliyi var.

Söz ehtiyatı

**2** Mətndə göy rəngdə verilmiş söz hansı mənada işlənib?

A) asqırmaq

B) dözüm, təmkin

# BAĞBAN və OĞULLARI

## I hissə

Bir bağbanın üç oğlu var idi. Bağban nə qədər çalışırdısa, oğlanlarını zəhmətə alışdıra bilmirdi. Özü də nə vaxt idi ki, xəstələnmişdi. Ona görə də bağı əkib-becərən yox idi. Uşaqlar bağa yaxın durmurdular.

Bir gün bağban övladlarını çağırıb dedi:

– Mən bu bağı sizə vəsiyyət edirəm.

Oğlanlar üz-gözlərini turşutdular. Bağban sözünə davam etdi:

– Bu bağda bir dəfinə basdırılıb. Ancaq bağın harasında olduğunu deməyəcəm. Özünüz qazıb taparsınız.

Bunu deyib bağban dünyadan köçdü.



Söz ehtiyatı

**1** Göy rəngdə verilmiş sözlərə diqqət yetir. Onları hansı sözlərlə əvəz etmək olar?

1.1. Alışdıra bilmirdi: A) yandıra bilmirdi
B) öyrəşdirə bilmirdi

1.2. Dünyadan köçdü: A) vəfat etdi
B) həlak oldu

1.3. Dəfinə: A) kağız
B) xəzinə

Düşün və cavab ver

**2** Səncə, doğrudanmı, bağban bağda dəfinə basdırmışdı? Niyə o, dəfinənin yerini demədi?

## II hissə

Yaz yenicə girmişdi. Oğlanlar hərəsi əlinə bir bel alıb bağın altını üstünə çevirdi. Bağ büsbütün şumlandı, amma dəfinə tapılmadı. Onlar kor-peşman evə döndülər.

Həmin il bağ üçqat artıq bar verdi. Qardaşlar bağın meyvəsini satıb çoxlu var-dövlət əldə etdilər. O vaxtdan onlar hər yaz torpağı şumlayır, ağacların dibini yumşaldırdılar.

**3** Aşağıdakı atalar sözlərində bəzi kəlmələrin yeri səhv düşüb. Həmin sözləri yerində düzgün işlətməklə atalar sözlərini oxu.

Atalar nə biçiblər, oğullar onu əkiblər.
İstəyirsən bel-kürək, al əlinə bal-çörək.
Yağmadı qamış, bitmədi yağış.

**4** Bu atalar sözlərindən hansı mətnin məzmununa daha çox uyğun gəlir?

**5** Aşağıda verilmiş atalar sözünün mənasını izah et.
Torpaq deyər: "Öldür məni, dirildim səni".

**6** Təsəvvür et ki, bağban, doğrudan da, bağda dəfinə basdırıb və oğulları yeri qazarkən bu dəfinəni tapıblar. Belə olsaydı, səncə, hekayə necə davam edərdi?

Söz ehtiyatı

**7** Yaxın mənalı sözləri müəyyən et.

| | |
|---|---|
| xəstə | xəzinə |
| dəfinə | bar |
| bahar | naxoş |
| məhsul | yaz |

# MƏKTƏBLİ QIZ

– Qızım, balam, adın nədir?
– Gülbahar.
– Yaxşı, sənin anan, atan varmı?
– Var.
– Söylə, varlıdırmı atan?
– Bəli, əmi, varlıdır.
– Elə isə geyimin niyə belə sadədir?
Yoxmu sənin sırğaların, qızıl bilərziklərin?
Söylə, qızım! Heç sıxılma...
– Var, əmi can, var... Lakin
Müəlliməm hər gün söylər:
"Onların yox qiyməti.
Bir qızın ancaq bilikdir, təmizlikdir zinəti".
– Lap doğru söz... Bu dünyada
Sənin ən çox sevdiyin kimdir, qızım, söylərmisən?
– Ən çox sevdiyim ilkin
O Allah ki yeri-göyü, insanları xəlq eylər.
– Sonra kimlər?
– Sonra onun göndərdiyi elçilər.
– Başqa sevdiklərin necə, yoxmu?
– Var...
– Kimdir onlar?
– Anam, atam, müəlliməm, bir də bütün insanlar.

*Hüseyn Cavid*

Sözlük

***Zinət*** – bəzək, yaraşıq

Şüurlu oxu

1. Mətndə göy rəngdə verilmiş sözlər kimin dilindən deyilir:
   A) məktəbli qızın
   B) yaşlı kişinin
   C) yaşlı qadının
2. Mətndən məktəbli qızın müəlliminin dediyi sözləri tap və izah et.

## QAYDALAR "K" SAMİTİNİN TƏLƏFFÜZÜ

Əlifbamızda hər hərf bir səsi işarə edir. "K" yeganə hərfdir ki, iki səsi işarə edir və iki cür adlanır: *ke* və *ka*.

K → *ke* hərfi: *kələm, körpü*
K → *ka* hərfi: *kosmos, konsert*

"*Ke*" samiti sözlərdə eyni cür tələffüz olunmur. Məsələn, *köynək* sözünün əvvəlindəki ***k*** yazıldığı kimi, sonundakı ***k*** isə bir qədər yumşaq – ***y*** səsinə yaxın tələffüz olunur. *Bitki* sözündə isə bu samit ***g*** kimi tələffüz olunur.

1. Hansı sözdə "ka" hərfi var?
   A) bilik
   B) katib
   C) dekabr

2. Sözlərdən birində "ke" hərfi var:
   A) kartof
   B) heykəl
   C) klub

3. Sözlərdən birində iki "ka" hərfi var:
   A) kələk
   B) külək
   C) skripka

4. Hansı sözdə "k" samiti "g" kimi səslənir?
   A) bitki
   B) məktəb
   C) kitab

5. Hansı sözdə "k" samiti fərqli səslənir?
   A) Kamil
   B) Kənan
   C) Beyrək

# ÜÇ ANA, ÜÇ OĞUL

**I hissə**

Bir kənddə üç qadın yaşayırdı. Hərəsinin bir oğlu vardı. Qadınlar öz oğullarını çox sevir, onlarla fəxr edirdilər.

Bir gün analar kəndin yaxınlığındakı bulaqdan evlərinə su aparırdılar. Vedrələr ağır olduğundan onlar tez-tez dayanıb dincəlirdilər. Hər dəfə ayaq saxlayanda söhbətləşir, öz oğullarından danışırdılar.

Birinci qadın alnının tərini silib dedi:

– Mənim oğlum çox güclüdür. 1 Kənddə yaşıdlarından heç kim onun qabağında duruş gətirə bilmir...

İkinci qadın bu sözləri eşidib tez birincinin sözünü kəsdi:

– Mənim oğlumun elə səsi var ki, oxuyanda bülbüllər də susub ona qulaq asırlar. 2

Üçüncü qadın sakitcə dayanmışdı. Onun susduğunu görən birinci qadın soruşdu:

– Ay bacı, sən niyə danışmırsan? Bəs sənin oğlun hansı bacarığın yiyəsidir?

– Nə deyim, vallah? Mənim oğlumun nə sən deyən gücü var, nə də səsi. 3



Şüurlu oxu

**1** Aşağıdakı cümlələr mətndən çıxarılıb və onların yeri nömrələnib. Cümlələrin mətndəki yerini müəyyən et.

- Sanki Rəşid Behbudovdur.
- Ancaq mən ondan razıyam.
- Elə bil Koroğlunun özüdür.

**II hissə**

Qadınlar yola davam etdilər. Bir azdan onlar kəndə çatıb küçədə oğullarını gördülər. Birinci qadının oğlu ağır daşları başı üzərinə qaldırıb yerə atırdı. Bir az kənarda ikinci qadının oğlu zil səslə bir mahnı oxuyurdu. Üçüncü qadının oğlu da küçədə idi. O, anasını görcək yaşıdlarından ayrıldı, qaça-qaça gəlib anasından vedrələri aldı.

Yolda, daşın üstündə bir ağsaqqal kişi oturmuşdu. Birinci qadın üzünü ona tutub dedi:

– Ağsaqqal, sən bizim oğullarımızı tanıyırsan. Onlar haqqında nə deyə bilərsən?

– Hansı oğullardan danışırsınız? Mən burada bir oğul görürəm, – deyə ağsaqqal üçüncü qadının oğlunu göstərdi.

Düşün və cavab ver

**2** Hansı oğul daha çox xoşuna gəldi? Səbəbini izah et.

**3** Üçüncü qadının oğluna fərasətsiz demək olarmı?

**4** Ağsaqqal kişinin cavabını necə izah edərdin?

**5** Mətnin 1-ci və 2-ci hissələrini adlandır.

Dil qaydaları

**6** Mətnin 2-ci hissəsində göy rəngdə verilmiş sözlərdən hansında -lar hissəciyi -dar kimi tələffüz olunur?

## ÜMUMİLƏŞDİRİCİ TƏKRAR

**1** Doğru, yoxsa yanlış?

- Sözlər necə deyilirsə, elə də yazılır.
- Bəzən yanaşı gələn saitlərdən biri tələffüz olunmur.
- Bəzi sözlərdə “o” yazılır, “a” deyilir.
- “K” hərfinin iki adı var: “ke” və “ka”.
- “Ka” samiti bütün sözlərdə eyni cür səslənir.
- “Ailə” sözündə hərflərin sayı səslərin sayından çoxdur.
- “Q” samiti bəzi sözlərdə “x”, bəzilərində “k” kimi səslənir.

**2** Vasif (“Vasifin gündəliyi”), Səməd (“Sehrli torba”) və bağbanın oğlanları (“Bağbanın oğulları”) arasında hansı oxşar cəhətlər var? Onların xarakterinin dəyişməsinə səbəb nə oldu?

**3** **Diqqətlə oxu.** Samirin atası tanınmış alimdir. Onu hamı “Tofiq müəllim” deyə çağırır. Tofiq müəllim həm də qayğıkeş atadır. Onun dörd oğlu var: Ayxan, Orxan, Elxan... Bəs dördüncü oğulun adı nədir?

**4** “Ailə” bölməsində oxuduğun əsərləri xatırla.
Ailə necə olmalıdır?
Uşaq-valideyn münasibətləri necə olmalıdır?
Bacı-qardaş münasibətləri necə olmalıdır?
Əsərlərdən misal gətirməklə fikirlərini söylə.

**5** Cütləri müəyyən et.

| | | | |
|---|---|---|---|
| 1 | dayı | A | ananın bacısı |
| 2 | bibi | B | atanın və ya ananın atası |
| 3 | baba | C | ananın qardaşı |
| 4 | xala | Ç | bacının əri |
| 5 | əmi | D | atanın və ya ananın anası |
| 6 | qayın | E | atanın bacısı |
| 7 | nənə | Ə | ərin və ya arvadın qardaşı |
| 8 | yeznə | F | atanın qardaşı |

BÖLMƏ

3

# SİNFİMİZİN UŞAQLARI

- Söz və onun mənası
- Ad bildirən sözlər
- -lar – çoxluq bildirən hissəcik
- Ad bildirən bəzi sözlərin böyük hərflə yazılışı



# AÇIQCA

Kəmalənin çoxlu qəşəng açıqcası var idi. Tənəffüsdə Naibə ona yaxınlaşdı, dərindən ah çəkərək dedi:

– Kəmalə, sən sinfimizdə ən yaxşı qızsan. Mən səni elə çox istəyirəm ki...

Kəmalə rəfiqəsinə razılıqla baxıb dedi:

– Doğrudan? Amma, deyəsən, hərdən çox pis oluram, özüm də hiss edirəm...

– Nə danışırsan?! Sən çox yaxşı qızsan. Sinifdə sənin kimi xeyirxah yoxdur. Heç kimdən heç nə əsirgəmirsən. Başqalarından bir şey istəyəndə vermirlər, paxıllıq edirlər. Amma səndən heç istəmək də lazım deyil. Çox vaxt özün verirsən. Məsələn, açıqca...

– A...a... açıqca...

Kəmalə çantasını açıb bir neçə açıqca çıxardı. Onları rəfiqəsinə uzadıb dedi:

– Əvvəldən belə deyəydin də.



Sözlük

***Açıqca*** – təbrik məktubu yazmaq üçün şəkilli vərəqə
***Riyakar*** – qeyri-səmimi, ikiüzlü
***Təvazökar*** – özünü sadə aparan, qürrələnməyən

## Düşün və cavab ver

1 Hekayənin qəhrəmanlarından hansı daha çox xoşuna gəldi: Kəmalə, yoxsa Naibə? Səbəbini izah et.

2 Sən Naibənin yerinə olsaydın, Kəmalədən açıqca almaq üçün ona necə müraciət edərdin?

3 Əks mənalı əlamətləri müəyyən et.

| | | | |
|---|---|---|---|
| 1 | kobud | A | riyakar |
| 2 | səmimi | B | lovğa |
| 3 | cəsur | C | mehriban |
| 4 | xəsis | Ç | qorxaq |
| 5 | təvazökar | D | əliaçıq |

4 Bir köməyə ehtiyacın olsa, sinifdəki uşaqlardan hansına müraciət edərsən? Səbəbini izah et: niyə məhz ona?

5 Naibə haqqında deyilənlərdən hansı ilə razısan?
A) kobuddur B) qayğıkeşdir C) hiyləgərdir

6 Kəmalə haqqında deyilənlərdən hansı ilə razı deyilsən?
A) paxıldır B) təvazökardır C) xeyirxahdır

7 Mətndən Kəmalənin təvazökar olduğunu göstərən hissəni oxu.

## Dil qaydaları

8 Mətnin 1-ci abzasında göy rəngdə verilmiş sözlərə diqqət yetir.
"Qəşəng" əlamət bildirən sözdür. O, hansı sözə aiddir?
"Yaxınlaşdı" hərəkət bildirən sözdür. O, kimin hərəkətini bildirir?

QAYDALAR

## SÖZ VƏ ONUN MƏNASI

Səslər birləşib söz yaradır. Lakin səsdən fərqli olaraq, sözün mənası olur. Sözlər nəyinsə və ya kiminsə adını, əlamətini, sayını və ya hərəkətini bildirir.

*Böyük qardaşım iki maraqlı kitab almışdı* cümləsində
- *qardaşım* və *kitab* ad bildirən sözlərdir;
- *böyük* əlamət bildirən sözdür, «qardaşım»a aid olan əlaməti bildirir;
- *maraqlı* əlamət bildirən sözdür, «kitab»ın əlamətini bildirir;
- *iki* say bildirən sözdür, «kitab»ın sayını bildirir;
- *almışdı* hərəkət bildirən sözdür, «qardaşım»ın hərəkətini bildirir.

Tətbiqetmə

**1** Nöqtələrin yerinə müvafiq sözlər işlətməklə ad, əlamət, hərəkət bildirən sözləri təyin et.

Xəlil bu çətin məsələni beş dəqiqəyə həll etdi.

*Xəlil, məsələ, dəqiqə* ... bildirən sözlərdir.
*Çətin* sözü ... əlamətini bildirir.
*Beş* sözü *dəqiqənin* ... bildirir.
*Həll etdi* sözü ... hərəkətini bildirir.

**2** Verilmiş cümlədəki sözlərlə bağlı fikirlərin doğru, yoxsa yanlış olduğunu müəyyən et.

Üç ay dincəldikdən sonra uşaqlar doğma məktəbə qayıtdılar.

*Üç* say bildirən sözdür. Uşaqların sayını bildirir.

*Doğma* əlamət bildirən sözdür. Məktəbin əlamətini bildirir.

*Dincəlmək* hərəkət bildirən sözdür. Uşaqların hərəkətini bildirir.

*Qayıtdılar* hərəkət bildirən sözdür. Məktəbin hərəkətini bildirir.

*Ay, uşaqlar, məktəb* ad bildirən sözlərdir.

# XOŞBƏXTLİK NƏDİR?

## I hissə

Ramin alnını pəncərənin soyuq şüşəsinə söykəyib həyətə baxırdı. Meydançada səs-küylə oynayan, sevinclə topun ardınca qaçan uşaqların yanaqları qıpqırmızı olmuşdu. Raminin isə solğun üzündə, gözlərində kədər vardı.

Otağın qapısı açıldı. İçəri daxil olan anası, həmişəki kimi, onun saçlarını sığalladı, üzündən öpüb dedi:

– Pəncərənin qabağında çox oturma, soyuq olar.

Anası stolun üstünü səliqəyə saldı. Əyilib yumşaq başmaqları Raminin  ayaqlarına geyindirdi. Qoltuq ağaclarını ona verərək yazı masasının arxasına keçməyə kömək etdi...



## II hissə

Məktəblər arasında bilik yarışması keçirilirdi. Ramin də yarışlarda iştirak edirdi. Onların komandası final mərhələsinə kimi gəlib çatmışdı. İndi finala ciddi hazırlıq gedirdi. Deyilənə görə, final yarışı televiziya ilə birbaşa yayımlanacaqdı.

Məktəbin direktoru və müəllimlər neçə gün idi ki, komandanın tərkibini müəyyənləşdirir, hər bir iştirakçının imkanlarını müzakirə edirdilər. Əli müəllim komandanın tərkibinə Raminin də salınmasında israr edirdi:

– Ramin çox mütaliə edir. Savadlı oğlandır. Məntiqi düşüncəsinə də söz ola bilməz.

Direktor isə tərəddüd edirdi:

– Bilirəm, Əli müəllim. Amma bizə bu yarışda diribaş uşaqlar lazımdır. Ramin isə çox sakitdir, elə bil özünə inamı yoxdur. Bildiyini də deməyə çəkinir.

– Amma keçən yarışlar göstərdi ki, Ramin komandaya lazımdır.

Ertəsi gün məktəbin akt zalında komandanın tərkibi elan edildi. Öz adını eşidəndə Raminin sevincinin həddi-hüdudu yox idi. Sinif yoldaşları onun başına toplaşdılar:

– Ramin, bizim sinifdən təkcə sənsən ha! Özünü göstər!

## III hissə

...Yarış çox gərgin keçirdi. Heç bir komanda irəli çıxa bilmirdi. Komandaların xalları bərabərləşmişdi. İndi hər şey sonuncu sualdan asılı idi. Hamı içini çəkib intizarla gözləyirdi. Nəhayət, aparıcı sualı səsləndirdi:

– Hər gün hovuza oradakı qədər su tökürdülər. Nəhayət, onuncu gün hovuz su ilə doldu. Bəs neçənci gün hovuz yarısına kimi dolmuşdu?

Sual sona çatanda Raminin ürəyi çırpındı. Onun barmağı «cavaba hazıram» düyməsində idi. Ancaq düyməni basmağa ürək eləmirdi. «Yəni finalda belə asan sual olar? Bəlkə, mən nəyi isə düzgün başa düşmədim?» – Ramin düşünürdü.



Elə bu zaman rəqib komandanın üzvlərindən biri düyməni basdı. Aparıcı ona söz verən kimi:

– Beşinci gün, – deyə qışqırdı.

– Düzgün cavab deyil, – aparıcının səsi gəldi.

Ramin güclə həyəcanını boğub düyməni basdı. Aparıcı sözü ona verdi. Bir anda hamının nəzərləri ona zilləndi. Ramin aydın səslə, aram-aram sualın cavabını söylədi:

– Doqquzuncu gün hovuz yarısına kimi dolmuşdu. Onuncu gün bir o qədər də su töküləndən sonra hovuz ağzına kimi doldu.

Araya sükut çökdü. Hamı aparıcının qərarını gözləyirdi. «Bu, ... düzgün cavabdır» sözləri səslənər-səslənməz alqış sədaları zalı bürüdü. Azarkeşlər əl çalır, «Ramin! Afərin!», – deyə qışqırırdılar.

Aparıcı Raminə yaxınlaşaraq mikrofonu ona tərəf tutdu:

– Həlledici balı komandaya siz qazandırdınız! Efir qarşısında nə deyə bilərsiniz?

– Mən… Mən çox xoşbəxtəm!

*Reyhan Yusifqızı*

Sözlük

***Tərəddüd etmək*** – qorxa-qorxa, inamsız hərəkət etmək
***İsrar etmək*** – dediyinin üstündə durmaq, təkid etmək

Düşün və cavab ver

1. Hansı cəhət Raminin xarakterinə uyğun deyil?
   A) utancaqdır
   B) qətiyyətlidir
   C) istedadlıdır

2. Hekayənin I və III hissələrində Raminin əhvalını müqayisəli şəkildə təsvir et.

3. Səncə, Ramin niyə özünü xoşbəxt sayırdı?

4. Səncə, Raminin gələcək taleyi necə olacaq? Əgər məktəb direktoru onu komandanın tərkibinə salmasaydı, bu, Raminin taleyinə necə təsir göstərərdi?

5. Raminə məktub yaz. Məktubda ona münasibətini və arzularını bildir.

## QAYDALAR AD BİLDİRƏN SÖZLƏR

Elə sözlər var ki, canlı və ya cansız varlıqların adını bildirir. Məsələn, *dəftər* cansız, *şagird* isə canlı varlığın adıdır. Belə sözlər *kim?*, *nə?*, *hara?* suallarına cavab verir.

Əlamət, say, hərəkət bildirən sözlər, adətən, ad bildirən sözlə bağlı olur, çünki onlar da həmin varlığın əlamətini, sayını və ya hərəkətini bildirir.

**1** "*Şagird dəftərini müəllimə göstərdi*" cümləsində canlı və cansız varlıqları bildirən sözləri tap.

**2** Cütləri müəyyən et.
*Nümunə: 1 - Ç (uzun çay)*

| | | | | |
|---|---|---|---|---|
| 1 | uzun | | A | meyvə |
| 2 | şirin | | B | yarpaq |
| 3 | ətirli | | C | dağ |
| 4 | yaşıl | | Ç | çay |
| 5 | uca | | D | gül |

**3** Cütləri müəyyən et.
*Nümunə: 1 - C (odun yarmaq)*

| | | | | |
|---|---|---|---|---|
| 1 | odun | | A | yemək |
| 2 | süd | | B | yumaq |
| 3 | çörək | | C | yarmaq |
| 4 | paltar | | Ç | ələmək |
| 5 | un | | D | içmək |

**4** Hansı sözlərin birləşməsi səhvdir?

A) maraqlı hekayə
B) uca dağ
C) qalın dəniz
Ç) sıx meşə

# DİLARƏ

Tabaşirə bulaşmışdı
Dilarənin saçı, üzü.
Arxayınca gəzirdi o,
Xəbərsizdi bundan özü.

Qəh-qəh çəkib gülüşdülər
Yoldaşları onu görcək.
Biri dedi: – Üzün ağdır,
Üstünə də tabaşir çək.





Biri dedi: – Nə gözəldir,
Nə qəşəngdir bu görkəmin,
Ağappaqsan, «Qar qız» olsun
Qoy bu gündən adın sənin.

Biri isə ... söz deyib,
... üzünə güldü onun.
Yaylığını çıxardaraq,
Üz-gözünü sildi onun.

*Tofiq Mütəllibov*

Şüurlu oxu

**1** Şeirin sonuncu bəndində nöqtələrin yerinə hansı söz uyğun gəlir?

A) nə B) gah C) həm

Düşün və cavab ver

**2** Şeirdəki uşaqlardan hansı daha çox xoşuna gəldi? Səbəbini izah et.

**3** Sinfinizdə buna bənzər hadisə baş veribmi? Bu zaman uşaqlar özlərini necə aparıb?

## Dil qaydaları

**4** Şeirin 1-ci bəndində hansı söz yerindən asılı olmayaraq, həmişə böyük hərflə yazılır?

A) Tabaşir B) Dilarə C) Xəbərsiz

**5** "Tabaşirə bulaşmışdı Dilarənin saçı, üzü" cümləsində ad bildirən neçə söz var?

A) 2 B) 3 C) 4

**6** Həmin sözlərdən neçəsi cansız, neçəsi canlı varlıq adı bildirir?

## Doğru, yoxsa yanlış

**7** Şeirdə göy hərflərlə verilmiş sözlər haqqında deyilənlərdən hansı doğru, hansı yanlışdır?

- Ad bildirən sözlərdir.
- Yaxın mənalı sözlərdir.
- Hərəkət bildirən sözlərdir.
- Hər iki söz yazıldığı kimi tələffüz olunur.
- Əlamət bildirən sözlərdir.
- Hər iki sözü "göyçək" sözü ilə əvəz etmək olar.

## DAVRANIŞ QAYDALARI

Tənəffüsdə uşaqlar yığışıb söhbət edirdilər. Birdən Fərhadın gözü Arifin köynəyinə sataşdı. Köynəyin iki düyməsi açılmışdı. Altdan Arifin maykası görünürdü. Deyəsən, buna Fərhaddan başqa heç kim fikir vermirdi.

**8** Sizcə, bu vəziyyətdə Fərhad nə etməlidir?

A) Əlini uzadıb köynəyin düymələrini bağlamalıdır.
B) Cəld bu haqda Arifi xəbərdar etməlidir.
C) Arifi kənara çəkib deməlidir ki, yaxasını bağlasın.

# AĞA VƏ NÖKƏR

Bəylərin, xanların məclisində nökərlər qulluq edirdilər. Nökərlərdən biri öz ağasına xüsusi diqqət göstərir, onun oturuşuna-duruşuna fikir verirdi.

Birdən nökər gördü ki, plov yeyən ağasının bığına iki düyü yapışıb. Nə qədər him-cim elədisə, ağası başa düşmədi.

Əlacsız qalan nökər hündürdən dedi:

– Ağa, deyirlər, meşədə iki quldur peyda olub. Beş igid qardaşı göndər, onları tutub gətirsin.



Ağa da arif adam idi. Əlini aparıb bığına yapışan düyüləri götürdü. Məclisdəkilər ağaya da, onun ağıllı nökərinə də "afərin" dedilər.

Sözlük

***Arif*** – ağıllı, hər şeyi başa düşən

***Him-cim eləmək*** – işarələrlə, əl və sifət hərəkətləri ilə nəyi isə anlatmaq

Düşün və cavab ver

1. "Dilarə" və "Ağa və nökər" əsərlərinin hər ikisi üçün eyni olan cəhəti göstər.
   A) Hər ikisinin baş qəhrəmanı pintidir.
   B) Hər iki əsərdə davranış qaydalarından bəhs olunur.
   C) Hər iki əsər şeir formasında yazılıb.

Dil qaydaları

2. Hansı cümlədə əlamət bildirən söz yoxdur?
   A) Nökərin ağası arif adam idi.
   B) Məclisdəkilər ağıllı nökəri tərifədilər.
   C) Bəylərin, xanların məclisində nökərlər qulluq edirdilər.

# MEHRİBAN SƏMA

Sevil müəllimə uşaqları tarlaya ekskursiyaya aparmışdı. Gözəl bir payız səhəri idi. Uzaqda köçəri quşların qatarı görünürdü. Quşların səsi azalmışdı, təbiət sanki qəmli görünürdü.

Müəllim uşaqlara dedi:

– Dünən biz sizinlə əlamət bildirən sözlər mövzusunu keçmişdik. İndi başınızı qaldırıb səmaya baxın. Onun əlamətlərini sadalaya bilərsinizmi?

Uşaqlar diqqətlə səmaya baxdılar və hərə öz fikrini söylədi:

– Səma gömgöydür...

– Səma mavidir...

– Səma təmizdir...

– Səma aydındır...



Sonra yenə də fikirlər təkrar olunurdu. Kənarda dayanan Kəmalə isə heç nə demirdi.

– Sən niyə danışmırsan?

– Səma mehribandır, – deyə Kəmalə gülümsündü.

Uşaqlar əvvəl susdular, sonra bayaqdan görmədiklərini gördülər və dilləndilər:

– Səma qəmlidir...

– Səma həyəcanlıdır...

– Səma soyuqdur...

### Düşün və cavab ver

1. Bəzən hansısa uşaq haqqında deyirlər: “Necə də şirin uşaqdır”. Bu cümlədə “şirin” sözünü necə izah edərdin? Bu söz “şirin alma” ifadəsindəki eyni sözdən nə ilə fərqlənir?
2. “Həyəcanlı səma” ilə “mehriban səma”nı müqayisəli təsvir et.
3. “Onun acı dili var” ifadəsindəki “acı” sözünü izah et.
4. “Onun böyük ürəyi var” ifadəsindəki “böyük” sözünü necə izah edərdin?

QAYDALAR **-LAR – ÇOXLUQ BİLDİRƏN HİSSƏCİK**

Ad bildirən sözün sonunda *-lar* hissəciyi varsa, bu, varlığın bir deyil, çox olduğunu bildirir. Məsələn:

*ağac* (1 dənə) – *ağaclar* (çoxlu)

Bu hissəcik həmişə *-lar*, *-lər* kimi yazılsa da, sözdən asılı olaraq müxtəlif cür deyilir.

| Yazılışı | Deyilişi |
|---|---|
| *şəhər**lər*** | *şəhər**rər*** |
| *qız**lar*** | *qız**dar*** |
| *dükan**lar*** | *dükan**nar*** |
| *kitab**lar*** | *kitap**lar*** |

Ad bildirən söz say bildirən sözlə işlənirsə, *-lar* hissəciyi artırılmır.

*Sinfimizdə **beş şagird~~lər~~** əlaçıdır.*

**1** Hansı sözün deyilişi ilə yazılışı fərqlidir?
A) analar B) qadınlar C) oğullar

**2** Deyiliş forması verilmiş hansı sözdə -dar hissəciyi çoxluq bildirmir?
A) kəntdər B) daşdar C) bayraxdar

**3** Hansı sözdə -lar hissəciyi -rar kimi tələffüz olunur?
A) qatarlar B) oğlanlar C) otaqlar

**4** Cütləri müəyyən et.

| | |
|---|---|
| vətəndaşlar | ordu |
| döyüşçülər | komanda |
| atlar | sürü |
| idmançılar | xalq |
| qoyunlar | naxır |
| inəklər | ilxı |

**5** Hansı söz -lar hissəciyi olmasa da, çoxluq bildirir?
A) qoşun B) şəhər C) məktəb

# İKİ GÜZGÜ

## I hissə

Dərsdən çıxan Leylanın qızlarla bir az oynayandan sonra qaşqabağı açıldı. Riyaziyyatdan aldığı «3» qiymətini də bir anlığa unutdu. Rəfiqələri ilə gülə-gülə sağollaşdı:

– Sabaha qədər!



Evlərinə gedən yolda böyük bir mağaza vardı. Leyla mağazanın qarşısında dayanıb şüşənin arxasındakı manekenlərə – əyninə al-əlvan paltarlar geyindirilmiş cansız gözəllərə baxdı. Ürəyindən keçdi ki, kaş o boyda bir kuklası olaydı.

Leyla vitrinin böyük güzgüsündə özünə baxıb razı halda gülümsədi: güzgüdə məktəbli forması geymiş qırmızıyanaq, şən bir qız görünürdü.

Yoluna davam edən Leylanın yadına nə düşdüsə, ayaqlarını sürüməyə başladı. Öz-özünə dedi: «Anam məni «3»ə görə danlayacaq. Nənəm, həmişəki kimi, dərman dalınca aptekə göndərəcək. Bacım Zərifə də, yəqin, yenə mənim albomumu vərəqləyib». Bunları düşündükcə Leylanın üzündəki təbəssüm yavaş-yavaş silinirdi.

Söz ehtiyatı

1 "Qaşqabağı açıldı", "Qaşqabağı yerlə gedir":
A) əks mənalı ifadələrdir.
B) yaxın mənalı ifadələrdir.

2 "Maneken" sözünü hansı sözlə əvəz etmək olar?
A) heykəl B) gəlincik C) müqəvva

3 Mətnin adında hansı sözlər var?
A) əlamət və ad bildirən sözlər
B) say və ad bildirən sözlər
C) ad və hərəkət bildirən sözlər

## II hissə

Qapının zəngini basanda Leylanın qaşqabağı yer süpürürdü. Nənəsinin addım səsləri gəldi. Bir azdan qapı açıldı:

– Ay mənim gözəl qızım, yemək istəyirsən? – Səlimə nənə mehribancasına soruşdu.

«Hər gün eyni şey! – Leyla qəzəblə düşündü. – Guya bilmir nə istəyirəm, nə istəmirəm. Təki danışsın».

– Mənim balam niyə belə kefsizdir? Xəstələnmisən, yoxsa «2» almısan? – deyə nənə soruşdu.

Leyla çığırdı:

– Niyə elə «2»?

– Nənənin üstünə qışqırma!

– Məni dərs hazırlamağa qoymursan.

O biri otaqdan Zərifənin səsi eşidildi:

– Dərsinə bax bunun! Guya mən bilmirəm ikinci sinifdə nə keçirlər?! Gəl mənim dərslərimi oxu, görüm necə oxuyursan!

– Üzündən zəhər tökülür, kobud! – Leyla incik-incik dilləndi. – Bir özünə güzgüdə bax.

– Özünsən kobud! Mən indi sənə göstərərəm...

Düşün və cavab ver

4 Leylanın kefi niyə pozulmuşdu? Səncə, adamın kefi pozulanda bunu ətrafdakılara hiss etdirməlidirmi?

Leyla qaçmağa hazırlaşanda qəfildən gözü güzgüdə özünə sataşdı: qaşları çatılmış, qəzəbli, hirsindən dodaqları əyilmiş bir qız. Yəni bu, bir az əvvəl mağazanın vitrinindəki güzgüdə gördüyü gülümsəyən qızdır?

Görəsən, bu qızlardan hansı əsl Leyladır?

*B.Leonidova*



## Şüurlu oxu

**5** Mətndəki hansı cümlələr Leylanın nənəsi və bacısı ilə kobud rəftar etdiyini göstərir?

**6** Hansı suala mətndə cavab yoxdur?

A) Nənəsi Leyladan niyə incidi?
B) Leylanın anası onun “3” aldığını biləndə nə etdi?
C) Leyla böyükdür, yoxsa bacısı?

## Düşün və cavab ver

**7** Leylanın üzünü gözəl və çirkin göstərən nə idi?

**8** Leylaya məktub yaz. Onun hərəkətlərinə münasibət bildir və məsləhətlərini ver.

QAYDALAR | AD BİLDİRƏN BƏZİ SÖZLƏRİN BÖYÜK HƏRFLƏ YAZILIŞI

Ad bildirən elə sözlər var ki, həmişə böyük hərflə yazılır. Belə sözlər konkret bir varlıq və ya yer adı bildirir. Məsələn, *şəhər* sözü kiçik hərflə yazılır, çünki dünyada şəhərlər çoxdur. Lakin *Gəncə* sözü böyük hərflə yazılır, çünki Gəncə adında bir şəhər var.

Sizin sinfinizdə Kamil və ya Aygün adında bir neçə şagird ola bilər. Lakin onların hamısının adı böyük hərflə yazılır, çünki Kamil və ya Aygün dedikdə konkret bir nəfər nəzərdə tutulur.

**1** Bu iki cümlənin mənasını araşdır.

1. *Camal gedər, kamal qalar* (atalar sözü).
2. *Camal gedər, Kamal qalar.*

Bu cümlələrin deyilişində fərq varmı?
Cümlələrdəki hansı sözün yazılışında fərq var?
Bu fərq cümlələr arasında hansı məna fərqinə səbəb olur?

**2** Hansı söz yerindən asılı olmayaraq həmişə böyük hərflə yazılır?

A) Azad
B) Bayram
C) Babək

**3** Hansı söz yerindən asılı olaraq həm böyük, həm də kiçik hərflə yazıla bilər?

A) Türkiyə
B) Qərənfil
C) Fatma

Məntiq

**4** *Ceyran, Maral, Tərlan, ...*
Hansı söz ardıcıllığı tamamlayır?

A) Rəna
B) Durna
C) ayı

# Turalın gündəliyindən

*24 fevral*. Neçə gün idi ki, qonşu həyətə gedib uşaqlarla oynayırdım. Evdə isə deyirdim ki, Anargildə dərslərimi hazırlayıram. Bu gün yalanımın üstü açıldı. Atam buna görə məni xeyli danladı.

*27 fevral.* Sinif yoldaşım Vüsal bizə gəlmişdi. Biz birlikdə dərslərimizi hazırladıq. Ayrılanda mən ona dedim:

– Anar riyaziyyatdan heç nə bilmir. Mən kömək eləməsəm, qiyməti “2” olacaq.

Atam bunu eşitdi. Vüsal gedəndən sonra məni yanına çağırıb danladı. Ancaq mən bunun səbəbini başa düşmədim. Axı mən bu dəfə yalan danışmamışdım.



Doğru, yoxsa yanlış

Atası Turalı niyə danlamışdı?

- Yalan danışdığına görə
- Sinif yoldaşlarını evə gətirdiyinə görə
- Dostunun dalınca danışdığına görə
- Anasının sözünə qulaq asmadığına görə

# Vüsalın gündəliyindən

<u>27 fevral.</u> Bu gün Turalgilə getmişdim. Biz birlikdə riyaziyyatdan ev tapşırığını yerinə yetirdik. Tural əlaçıdır. Sinfimizdə riyaziyyatı onun kimi yaxşı bilən yoxdur. O, mənə çətin misalları başa saldı. Ancaq mən bir də onunla bir yerdə hazırlaşmayacağam. Bir az lovğa oğlandır. Özü də adamın dalınca danışır. Bu gün də Anarı pisləyirdi. Axı Anar onun dostudur. Adam da öz dostunun dalınca danışar? Tural ata-anasına yalan danışanda Anar onu satmadı.

Bu da onun yaxşılığı!

## Sözlük

***Qeybət*** – başqasının dalınca xoşagəlməz sözlər danışmaq

"*Gündəlik*" sözünün mənalarını araşdır.

## Şüurlu oxu

**1** Turalın və Vüsalın gündəliklərində qeyd olunanların düzgün ardıcıllığını tap.

A. Dostunun qeybətini elədiyinə görə atası Turalı danladı.
B. Turalla Vüsal bir yerdə dərslərinə hazırlaşdılar.
C. Tural Anarın qeybətini elədi.
Ç. Yalan danışdığına görə atası Turalı danladı.
D. Tural evdə valideynlərinə yalan danışırdı.

## Dil qaydaları

**2** "Turalın gündəliyi"ndəki göy rəngdə verilmiş söz nəyə aiddir: varlığa, yoxsa hərəkətə?

**3** "Vüsalın gündəliyi"ndəki göy rəngdə verilmiş sözlərdən hansı əlamət bildirən sözdən düzəlmiş hərəkət bildirən sözdür?

# SEHRLİ SÖZ

## I hissə

Parkdakı yaşıl skamyalardan birində qoca kişi oturmuşdu. Onun uzun, ağ saqqalı var idi. Əlindəki çətirlə torpaqda nə isə cızırdı.

Balaca Pərviz qocaya yaxınlaşıb acıqlı səslə dedi:

– Bir az çəkilin. Mən də oturmaq istəyirəm.

Qoca bir az kənara çəkilib Pərvizə yer verdi. Balacanın qızarmış, hirsli üzünə baxıb dedi:

– Sənə nə olub?

– Mənə heç nə. Nədir ki?

– Sən kimdənsə küsmüsən. Özün də ağlamısan.

– Düzdür. Hardan bildiniz?

– Mən sehrbazam.

– Bah! Elə bilirsiniz uşağam? Yox, mən belə şeylərə inanmıram.

– Yəni mən düz demədim? – qoca incik səslə soruşdu.

– Yox. Düzdür, mən evdəkilərdən küsmüşəm. Belə getsə, evdən qaçacağam.

– Qaçacaqsan?

– Hə, qaçacağam. Leylanın nə qədər flomasteri var, birini də mənə vermir.



– Buna görə evdən qaçarlar?

– Təkcə bu olsaydı, nə var idi! Nənəm bir qoğala görə məni mətbəxdən qovdu. Qardaşım qayıq sürməyə gedir, məni aparmır. Heç kim məni sevmir. Yox, qaçacağam evdən.

Qoca uzun saqqalını tumarlayıb fikrə getdi. Sonra üzünü Pərvizə çevirib dedi:

– Hə, balaca, sənin işin çətindir. Amma mən sənə kömək edə bilərəm. Bir sehrli söz bilirəm. Onu kimə desən, səndən heç nə əsirgəməz. Ancaq bu sözü deyəndə həmin adamın düz gözlərinə baxmaq lazımdır.

Pərviz qocanın sözlərinə inanmasa da, yavaşca soruşdu:

– O nə sözdür elə?

Qoca əyilib oğlanın qulağına nəsə pıçıldadı və ucadan dedi:

– Amma sözü demək qaydasını unutma ha!

– Mən indi yoxlayaram.

Bunu deyib Pərviz ayağa qalxdı və evlərinə sarı qaçdı.

## Düşün və cavab ver

1. Səncə, qoca kişi Pərvizin qulağına nə pıçıldadı?
2. Qocanın "sehrli sözü" Pərvizə kömək edəcəkmi?
3. Qruplara bölünün və hekayənin davamı ilə bağlı hər qrup öz variantını hazırlasın.
4. Pərvizin qoca kişi ilə danışığındakı hansı ifadələr onun kobud olduğunu göstərir?
5. Mətnin birinci hissəsini səhnələşdirin.

## Dil qaydaları

6. Mətnin birinci cümləsində ad, əlamət, say, hərəkət bildirən sözləri sadala.
7. Altından xətt çəkilmiş cümlələrdən hansında hərəkət gələcəkdə baş verəcək?
8. Göy rəngdə verilmiş abzasın hansı cümləsində ad, əlamət, say, hərəkət bildirən sözlərin hamısı iştirak edir?

## II hissə

Leyla oturub nəsə çəkirdi. Qarşısında yaşıl, qırmızı, göy, sarı flomasterlər var idi. Pərvizi görən kimi flomasterləri qabağına çəkib əli ilə üstünü örtdü.

«Qoca aldatdı məni, – Pərviz düşündü. – Beləsinə söz təsir edər?»

Pərviz bacısına yaxınlaşdı, düz onun gözlərinə baxıb yavaşca dilləndi:

– Leyla, mənə flomaster ver də... Zəhmət olmasa...

Leyla gözlərini süzdü, sonra diqqətlə Pərvizə baxdı, əlini flomasterlərin üzərindən çəkib dedi:

– Hansını istəyirsən?

– Mmməən?.. Göyü.

Leyla göy flomasteri götürüb Pərvizə verdi.



Pərviz bu işə mat qaldı. «Gedim nənəmin yanına, görüm indi də məni qovacaqmı?»

Nənə mətbəxdə qoğal bişirirdi. Balaca Pərviz onun yanına gəlib yavaşca ətəyindən dartdı. Nənəsi üzünü ona sarı çevirəndə düz gözlərinə baxıb dedi:

– Nənə, ______, mənə bir dənə qoğal ver.

Nənənin üzü sanki işıqlandı. O, şirin səslə dedi:

– Gözəl balam isti qoğal istəyir? Nənə sənə qurban, bu dəqiqə ən dadlısını seçəcəyəm sənin üçün.

Pərviz nənəsinin boynuna sarılıb onun qırışmış üzündən öpdü.

## III hissə

Nahar vaxtı idi. Pərviz sakitcə dayanıb qardaşı Kamranın söhbətinə qulaq asırdı. Kamran dedi ki, sabah qayıqla göldə gəzintiyə çıxacaq. Bu zaman Pərviz qardaşına yaxınlaşıb əlini onun çiyninə qoydu və yavaşca dedi:

– Kamran, zəhmət olmasa, sabah məni də özünlə gəzintiyə apar.

Hamı birdən susdu. Kamran təəccüblə əvvəl nənəsinə, sonra bacısına baxdı.

– Apar da onu, – Leyla dilləndi. – Səndən nə gedir ki...

– Niyə də aparmayasan? – nənə gülümsündü. – Uşaqdır da, könlü istəyir.

– Zəhmət olmasa... – Pərviz təkrar etdi.

– Yaxşı da, sən deyən olsun, – Kamran, nəhayət, dilləndi. – Get yığış. Səhər yola çıxırıq.

Pərvizin sevincinin həddi-hüdudu yox idi. «Alındı! Hamıya təsir etdi. O, doğrudan da, sehrbazdır».

Pərviz yerindən sıçrayıb küçəyə çıxdı. Parka kimi dayanmadan qaçdı. Amma qoca orada yox idi. Yalnız skamyanın qabağında, torpağın üzərində onun çəkdiyi cızma-qara qalmışdı.

*V.Oseyeva*

Düşün və cavab ver

**9** Mətnin ikinci hissəsini oxuduqdan sonra deyə bilərsinizmi, qoca kişinin pıçıldadığı "sehrli söz" nə imiş?

**10** Mətndəki mavi zolağın yerində hansı sözlər olmalıdır?
A) tez ol
B) qoğal istəyirəm
C) zəhmət olmasa

**11** Qocanın "sehrli söz"ünü hansı ifadə ilə əvəz etmək olar?
A) üzr istəyirəm
B) xahiş edirəm
C) qurban olum

**12** Mətndəki qoca kişi haqqında nə demək olar?
A) müdrikdir
B) sehrbazdır
C) zarafatcıldır

**13** Mətnin ikinci hissəsini səhnələşdirin.

Bənöfşəyəm, bənöşə,
Düşmüşəm dilə-dişə.
Məni qızdar, oğlanlar
Dərib taxırlar döşə.

1 Şeirdə gül adı iki cür yazılmışdır. Hansı düzdür?

A) bənöfşə
B) bənöşə
C) Heç biri düzgün yazılmayıb, “bənövşə” yazılmalıdır.

2 Hansı benddə altından xətt çəkilmiş sözlərin hər ikisi düzgün yazılıb?

A) qızlar, oğlannar
B) qızdar, oğlannar
C) qızlar, oğlanlar

3 *Nərgiz, Lalə, Yasəmən, ...*
Hansı söz ardıcıllığı tamamlayır:

A) Qərənfil B) Vəfa C) Leyla

4 *Bakı, Sumqayıt, Gəncə, ...*
Hansı söz ardıcıllığı tamamlayır:

A) Xəzər B) Araz C) Quba

5 “Keçinin üç dəcəl balaları var idi” cümləsindəki hansı sözdə səhvə yol verilib?

A) keçinin B) dəcəl C) balaları

Seçimini izah et.

A) Heyvanın balası haqqında “dəcəl” deməzlər.
B) “Bala” əvəzinə “çəpiş” demək lazımdır.
C) Ad bildirən söz say bildirən sözlə işlənirsə, -lar hissəciyi artırılmır.

6 Hansı söz yerindən asılı olaraq həm böyük, həm də kiçik hərflə yazıla bilər?

A) İbrahim
B) Qəhrəman
C) Yusif

BÖLMƏ 4

# HEYVANLAR və QUŞLAR

- Əlamət bildirən sözlər
- Say bildirən sözlər
- Hərəkət bildirən sözlər



# AYI VƏ ŞİR



Əlbir olub bir ayı bir şir ilə,
Ovladılar dovşanı tədbir ilə.
Olmadılar razı onu bölməyə,
Çıxdı iş axır ölüb-öldürməyə.
Çeynədilər, dişlədilər, diddilər,
Bir-birini al qana qərq etdilər.
Özlərini taqətdən saldılar,
Hər biri bir səmtə düşüb qaldılar.
Tülkü uzaqdan görüb bu haləti,
Bildi ki, yox heç birinin taqəti.
Gəldi, götürdü ovu, etdi *fərar,*
Həsrət ilə baxdı dalınca onlar.

*Abbas Səhhət*





Sözlük

***Fərar etmək*** – qaçmaq, aradan çıxmaq

Şüurlu oxu

1. Hansı atalar sözü mətnin məzmununa uyğundur?
   A) Ayı meşədən küsüb, meşənin xəbəri yox.
   B) Artıq tamah baş yarar.
   C) Tülkü tülkülüyünü sübut edincə dərisini boğazından çıxararlar.
2. Əsərin hansı qəhrəmanı şəkildə əks olunmayıb?

## HEYVANLAR NECƏ QORUNURLAR?



Heyvanların çoxu özünü düşməndən qorumaq üçün silaha malikdir. Pişik caynaqları, arı neştəri, kirpi ..., keçi ..., ilan ..., pələng pəncəsi, it isə dişi ilə güclülərdən müdafiə olunur. Tülkü isə təhlükə hiss etdikdə özünü ölülüyə vurur.

Bəzi heyvanlar yaşadığı mühitə uyğunlaşmaqla özünü qoruya bilir. Məsələn, buqələmun düşdüyü yerdən asılı olaraq rəngini dəyişə bilir. Şimal tülküsünün tükləri qışda ağ və qalın, yayda isə seyrək və qəhvəyi rəngdə olur. Səhrada yaşayan dəvənin ayaqları qumda, şimal ayısının ayaqları isə qarda batmır.

### Sözlük

***Neştər*** – arı, əqrəb kimi canlılarda sancdıqları yerə zəhər buraxmaq üçün orqan

***Buqələmun*** – kərtənkələyə bənzər sürünən heyvan

### Şüurlu oxu

**1** Mətndəki əsas fikir nədən ibarətdir?

A) Vəhşi heyvanlar yırtıcı olur.

B) Hər bir heyvanın yaşadığı mühitə uyğun bədən üzvləri və vərdişləri var.

C) Çöl heyvanlarının həyatı daim təhlükə altındadır.

### Düşün və cavab ver

**2** 1-ci abzasda nöqtələrin yerinə hansı sözlər uyğun gəlir?

*zəhəri, tikanları, buynuzu*

**3** Mavi rənglə verilmiş cümləyə diqqət et: səncə, tülkü nə üçün belə dəyişir?

QAYDALAR **ƏLAMƏT BİLDİRƏN SÖZLƏR**

Əlamət bildirən sözlər varlığın, bəzən də hərəkətin əlamətini bildirir. Bu sözlər *necə?*, *nə cür?*, *hansı?* suallarına cavab verir.

*Turistlər **yaşıl** çəməndə çadır qurdular.*

Bu cümlədə "yaşıl" əlamət bildirən sözdür və o, varlığın (*çəmənin*) əlamətini bildirir.

*Aygün dərslərini **yaxşı** oxuyur.*

Bu cümlədə "yaxşı" əlamət bildirən sözdür və o, hərəkətin (*oxuyur*) əlamətini bildirir.

1. Hansı söz yerindən asılı olaraq həm əlamət, həm ad bildirir?
   A) mürəkkəb    B) böyük    C) bahar

2. Cümlələrdən birində əlamət bildirən söz var:
   A) Ağacdələn ağacları xəstəlikdən qoruyur.
   B) Qarğa qozun ləpəsini sındırıb yeyir.
   C) Dəvəquşu dünyada ən iri quşdur.

3. Hansı sırada yaxın mənalı əlamət bildirən sözlər verilmişdir?
   A) hündür, uca
   B) uzun, qısa
   C) qaçmaq, yüyürmək

4. Hansı sırada əks mənalı əlamət bildirən sözlər verilmişdir?
   A) gözəl, qəşəng
   B) şən, kədərli
   C) böyük, enli

5. Hansı cümlədə hərəkətin əlamətini bildirən söz var?
   A) Bu göygöz pişiyin şəklini istedadlı bir rəssam çəkib.
   B) Rüfət çox qəşəng bir pişik şəkli çəkmişdi.
   C) Rüfət pişiyin şəklini çox gözəl çəkmişdi.

# ŞİR VƏ SİÇAN

1



A. Bir gün şir tələyə düşdü. Nə qədər çalışdısa, torun iplərini qıra bilmədi. Acıqlanmış şir var gücü ilə nərildədi.

B. Şir oyanıb siçanı tutdu. Siçan yalvarmağa başladı. O, şirə dedi:

– Əgər məni buraxsan, sənə yaxşılığım dəyər.

Şir siçanın sözlərinə güldü. Ancaq ona dəyməyib azadlığa buraxdı.

2



C. Günlərin bir günü qoca şir ağacın altında yatmışdı. Bir siçan onun üstünə çıxıb o yan-bu yana qaçmağa başladı.

Ç. Nəhayət, şir canını tordan qurtarıb siçana dedi:

– O vaxt mən sənin sözlərinə güldüm. Ancaq, sən demə, siçanın da şirə yaxşılığı dəyərmiş.

3



D. Şirin ________ eşidən siçan özünü ona yetirdi. Torun iplərini gəmirməyə başladı.

4



## Şüurlu oxu

**1** Şəkillərə bax və mətnin hissələrinin düzgün ardıcıllığını tap.

A) B, D, A, Ç, C
B) Ç, A, D, C, B
C) C, B, A, D, Ç

5



**2** Mətnin sonuncu hissəsində mavi zolağın yerinə hansı söz uyğun gəlir?

A) hürüşünü
B) nəriltisini
C) mələməsini

# DƏVƏLƏR

## I MƏTN

Belləri yəhər kimi,
Gözləri fənər kimi
Uzunayaq dəvələr,
Yekədodaq dəvələr.
Beş gün ac da gəzərlər,
Susuzluğa dözərlər.
Ancaq incitsən bir az,
Düz yeddi il unutmaz.
Beli yəhər dəvələr,
Gözü fənər dəvələr.

*Zahid Xəlil*



## II MƏTN

Dəvə çox dözümlü heyvandır, günlərlə ac-susuz qala bilir. Onun belindəki çıxıntıya hürgüc deyirlər. Bəzi dəvələrin bir, bəzilərinin isə iki hürgücü olur. Uzun səfərə çıxmazdan əvvəl dəvə doyunca yeyib-içir. Yeyib-içdiyinin bir hissəsini həzm edir, qalanlarını piyə çevirib hürgücündə dar günə saxlayır.

Dəvə səhrada çətinlik çəkmədən hərəkət edir. Onun ayaqları xüsusi piy qatı ilə örtüldüyünə görə isti qumda yanmır. Dəvənin yunu onu qızmar günəşdən və gecənin soyuğundan qoruyur. Dəvə səhrada bitən acı yovşanla, tikanlı kollarla da qidalanır.

Dəvə ev heyvanıdır. Onun əti yeməlidir. Dəvənin isti yunundan qiymətli paltarlar toxunur, yorğan-döşək hazırlanmasında istifadə olunur. Dəvədən səhra və çöllərdə minik üçün də istifadə edirlər.

### Şüurlu oxu

1 Dəvə haqqında 1-ci mətndə olan hansı məlumat 2-ci mətndə yoxdur?

A) Dəvə aclığa dözümlüdür.
B) Dəvənin belində bir və ya iki hürgüc olur.
C) Dəvə kinli olur.

**Yadda saxla**

Şeir misralardan ibarət olur. Misra şeirin bir sətridir. Şeirdə müəyyən misralar qafiyələnir, yəni onların sonluğu oxşar səslənir.

Şeirin misralarında hecaların sayı çox vaxt eyni olur. Bu, şeirdə ritm yaradır.

Qafiyə və ritm şeirə xüsusi gözəllik verir, onu hekayə və nağıldan fərqləndirir.

2. Dəvə haqqındakı hansı mətn şeirlə yazılıb?

3. Dəvələr haqqında şeirdə neçə misra var?
Hər misrada neçə heca var?

4. "Dəvələr" şeirinin son iki misrasında qafiyəni hansı sözlər yaradır?
A) beli, gözü
B) yəhər, fənər
C) gözü fənər

5. 2-ci mətndə neçə abzas var?

6. 2-ci mətnin hansı abzasında dəvənin ev heyvanı kimi xeyrindən danışılır?

7. Dəvə haqqında mətnlərdə hansı suala cavab yoxdur?
Necə olur ki, dəvə uzun müddət ac-susuz qala bilir?
Dəvənin südünü içmək olarmı?
Dəvə səhranın istisindən necə qorunur?

8. "Dəvədən böyük fil də var" atalar sözünü necə başa düşürsən?

9. "Allah dəvəyə qanad versə, uçulmamış dam qalmaz" atalar sözünü izah et.

# QUŞLAR

Mənim babam cavanlıqda çox mahir ovçu olub. O, quşların səsini çıxara bilirmiş. Elə indinin özündə də babam əlini ağzına tutub kəkliyi, meşətoyuğunu, bildirçini yamsılaya bilir.

Babam danışır ki, bir dəfə kolluqda gizlənib bildirçin səsi çıxarırmış. Bildirçinlər yaxına gələndə istəyir, onları tüfənglə vursun. Elə bu vaxt yuxarıdan başına bir zərbə dəyir. Əgər papağı qalın olmasaymış, yəqin ki, huşunu itirərmiş. Çevrilib baxanda görür ki, zərblə başına dəyən qırğıdır. Qırğı bildirçin səsini eşidib ova gəlirmiş. O, qarşısındakının quş olmadığını görsə də, özünü ona çırpmışdı. Çünki quşlar gördüyündən çox, eşitdiyinə inanır.



Quşlar təhlükə barəsində bir-birinə xəbər ötürür, səslə həyəcan siqnalı verirlər. Təhlükəni birinci görən quş xəbərdarlıq etməyi özünə borc bilir.

Sözlük

***Qırğı*** – iti caynaqlı yırtıcı quş

1 Mətndə göy hərflə verilmiş "siqnal" sözünü hansı sözlə əvəz etmək olar? A) işıq B) işarə C) sifariş

Şüurlu oxu

2 Mətndə quşların hansı xüsusiyyətindən danışılır?
A) qidalanmasından B) balalamasından C) oxumasından

Dil qaydaları

3 "Kəklik" sözündə üç "k" samiti var. Onlardan hansı yazıldığı kimi tələffüz olunur?

## AĞACDƏLƏN



Bütün meşələrdə ağacdələnin səsini eşitmək olar. Ağacdələn səhərdən axşamacan işləyir. Quyruğunu ağaca dayayıb caynaqları ilə ondan bərk-bərk yapışır. Sonra dəmir kimi möhkəm dimdiyi ilə ağacı dəlir, uzun, yapışqan dili ilə həşəratları oyuqdan çıxarır. Bu yolla ağacdələn ziyankar həşəratları dənləyib ağacları xəstəlikdən qoruyur.

Düşün və cavab ver

**4** Ağacdələni necə adlandırmaq olar?

A) meşə kralı B) meşə həkimi C) meşə müğənnisi



## QARĞA

Bu quş hər şeyi yeyir. Başqa quşların yuvalarından yumurta oğurlamaq onun gündəlik işidir. Qarğa ölmüş heyvanın əti ilə də qidalanır. Qarğanın ən sevimli yeməyi isə qozdur. O, qozu hündürdən bir daşın üstünə atır. Qoz daşa dəyib sınır və qarğa qozun ləpələrini yeyir.

Dil qaydaları

**5** Mətndə göy rəngdə verilmiş hansı söz ad bildirir?

## DƏVƏQUŞU



Dəvəquşu dünyada ən iri quşdur. Onun hündürlüyü 2 metrdən, çəkisi 130 kiloqramdan çox olur. Dəvəquşunun yumurtası da çox iri olur.

Bu ağırlıqda quş, əlbəttə, uça bilməz. Lakin saatda 120 kilometr sürətlə qaçan dəvəquşu maşınla yarışa bilər.

Şüurlu oxu

**6** Hansı mətndə quşun necə qidalanması haqqında heç bir məlumat yoxdur?

## QAYĞIKEŞ VALİDEYNLƏR

Heyvanlar və quşların çoxu insanlar kimi öz balalarını sevir, onların tərbiyəsi ilə məşğul olur. Onlar balalarını qorumaq üçün qat-qat güclü düşmənlə ölüm-dirim mübarizəsinə çıxa bilərlər.

Yumurtadan yenicə çıxmış cücəyə çox yaxın gəlmək məsləhət deyil. Çünki ana toyuq həmin an sizə hücum edib üz-gözünüzü dimdikləyə bilər.



Hər heyvan öz balasına bir cür baxır. Ata canavar ana canavarla birlikdə balalarının qayğısına qalır. Balalar körpə olanda ana onlara süd verir, ata isə ailəni yeməklə təmin edir.

Pələng öz balalarına uzun müddət tərbiyə verir. Üç il ərzində ov etməyin bütün sirlərini onlara öyrədir.

Lakin elə heyvanlar da var ki, balası ilə heç məşğul olmur. Məsələn, dələ balalarının gözləri açılan kimi onları atır. Ququ quşu isə heç özünə əziyyət verib yumurtadan bala çıxmasını da gözləmir. O, başqa quşların yuvasında ______ və yumurtadan çıxan balanı həmin yuvanın sahibi yedizdirir.

Şüurlu oxu

**1** Mətndə hansı suala cavab yoxdur?

A) Canavar ailəsində atanın rolu nədən ibarətdir?
B) Pələng öz balasına nə öyrədir?
C) Ququ quşunun yumurtası nə boyda olur?

**2** Mətndə mavi zolağın yerinə hansı söz uyğun gəlir?

A) yumurtlayır B) yatır C) dincəlir

**3** "Şir və siçan" və "Qayğıkeş valideynlər" mətnlərindən hansını nağıl adlandırmaq olar?

# QAZLAR

## I MƏTN

Səməd göydə uçan qazları görüb atasından soruşdu:
- Ata, bizim qazlar da belə uça bilər?

Ata dedi:
- Yox, oğul, ev qazları uça bilmir.
- Niyə?
- Ona görə ki tənbəlləşiblər. Quşlar bir yerdən başqa yerə yem dalınca və soyuqdan qorunmaq üçün uçurlar. Ev quşlarının belə qayğısı yoxdur. Onları sahibləri yemləyir və hin düzəldirlər ki, soyuq düşəndə yerləri isti olsun. Odur ki, bu quşlar bir çox bacarıqlarını itiriblər. İnsan da belədir. O uşaq ki həmişə başqalarının köməyinə arxalanır, hamıdan kömək gözləyir, heç vaxt güclü, ağıllı, çevik ola bilməz.



Şüurlu oxu

1. Hansı fikir 1-ci mətnin məzmununa daha çox uyğun gəlir?
A) Ev quşları sahibinə sadiq olur.
B) Həyatda güclü olmaq üçün çətinliyə qatlaşmaq lazımdır.
C) Ev quşları aciz olur.

# II MƏTN

Bir həyətdə iki qaz yaşayırdı. Onlardan biri boz, digəri ağ rəngdə idi. Qazlar həmişə bir yerdə gəzirdilər. Boz qazın qorxusundan dəcəl uşaqlar onlara yaxın düşə bilmirdilər.

Bir gün ağ qaz səhər tezdən oyanıb həyətə çıxdı. Yoldaşını səsləmədi, düşündü ki, təkcə gedib qarnını doyurar.

Bir azdan boz qaz da oyandı. Yoldaşını tapmayıb qışqırdı:

– Qa-qa-qa!

Cavab verən olmadı. Boz qaz yoldaşını çox axtardı. Birdən dərədən ağ qazın qışqırtısı eşidildi. Boz qaz səs gələn tərəfə qaçdı. Dəcəl bir oğlan ağ qazı qovurdu. Boz qaz boğazını uzadıb fısıldayaraq ona hücum çəkdi. Oğlan qorxub qaçdı.

Boz qaz ağ qaza yaxınlaşıb dedi:

– Bəs məni niyə çağırmadın?

Ağ qaz utandığından başını aşağı saldı.



## Şüurlu oxu

1. 2-ci mətndə qazlar haqqında hansı məlumat var?

A) Ev qazlarından fərqli olaraq, çöl qazları uça bilir.
B) Çöl qazları köçəri quşlardır.
C) Qazlar düşmənlərini qorxutmaq istəyəndə boyunlarını uzadıb fısıldayırlar.

## Düşün və cavab ver

2. Qazlar haqqında hansı mətni nağıl adlandırmaq olar?

3. Mətnlərə ad ver.

4. Bəzi evlərdə bülbül, tutuquşu saxlayırlar. Səncə, bu quşlara ev quşları demək olarmı?

## Məntiq

5. Dördündən biri fərqlidir:

A) qaz B) kəklik C) toyuq Ç) hinduşka

## Dil qaydaları

6. "Qaz" sözünü cümlədə hərəkət bildirən söz kimi işlət.

7. Göy rəngdə verilmiş cümlədəki sözlərdən:

A) Biri ad, ikisi əlamət, ikisi hərəkət bildirir.
B) İkisi ad, ikisi say, biri hərəkət bildirir.
C) İkisi ad, biri əlamət, biri say, biri hərəkət bildirir.

## Araşdırma

8. Mətnlərdəki məlumatları birləşdirərək qazlar haqqında danış. Bu quş haqqında yeni məlumatlar əldə etməyə çalış.

# SİÇANLA QURBAĞANIN DOSTLUĞU

Bir gün siçan qurbağanın yanına gəlib dedi:

– İkimiz də təkik, darıxırıq. Gəl dost olaq. Hərdən görüşək, söhbət edək, dərdimiz dağılsın. Bir ip gətirim, bir ucunu sənin ayağına bağlayaq, o biri ucunu da mənim. Bir-birimizə nə zaman gərək olsaq, ipi çəkək.

Siçan çox dil tökəndən sonra qurbağanı razı saldı. Uzun ip gətirib bir ucunu qurbağanın, o biri ucunu da öz ayağına bağladı.



Bu söhbətdən iki gün keçdi. Qurbağa göl qırağına çıxıb otluqda oturmuşdu. Hərdən tənbəl-tənbəl boynunu uzadıb başının üstündə uçuşan cücüləri tutub yeyirdi. Siçan da yaxınlıqdakı zəmidə sünbül qırıb yeyirdi. Birdən bir qaraquş şığıyıb siçanı tutdu. Dimdiyinə alıb göyə qaldırdı. İpin bir ucu qurbağanın ayağına bağlı olduğuna görə o da göyə qalxdı.



Göydə uçan bir sərçə qurbağadan soruşdu:

– A qurbağa, bu nə haldır, yoxsa suda-quruda yaşamaqdan bezmisən, indi də göylərin seyrinə çıxmısan?

Qurbağa isə belə cavab verdi:

– Dostum, üstünü vurma. Öz tayı ilə dostluq etməyənin günü elə mənimki kimi olar.

## Düşün və cavab ver

**Hansı atalar sözü mətnin məzmununa uyğun gəlir?**

A) Cəhənnəmə gedən özünə yoldaş axtarar.

B) Dost dosta tən gərək,
Tən olmasa gen gərək.

C) Dağ dağa qovuşmaz, insan insana qovuşar.

# QURBAĞALAR



1 Çox az adam tapılar ki, qurbağadan xoşu gəlsin. Bir çoxları onu əlinə almağa da qorxur. Deyirlər ki, qurbağa adamın əlinə *ziyil* salır. Amma bu, doğru deyil.

2 Məsələ burasındadır ki, qurbağanın dərisi sarımtıl maye *ifraz edir*. Həmin maye pis qoxu verir və ona yaxınlaşmaq istəyənləri qorxudur. Bu yolla qurbağa düşmənlərindən qorunur. Axı onun nə iti dişləri, nə də qaçan ayaqları var.

3 Qurbağa nəinki ziyanverici heyvandır, əksinə, təbiət üçün faydalıdır. O, gölməçələrdə, bataqlıqlarda həddən artıq çox olan ziyanverici həşəratları – ağcaqanadları, milçəkləri məhv edir.

4 Elə qurbağalar var ki, əti yemək üçün yararlıdır. Bəzi xalqların mətbəxində qurbağa ətindən hazırlanmış yemək növləri var.

### Sözlük

***Ziyil*** – dərinin üstündə əmələ gələn düyüncük, yara
***İfraz etmək*** – kənara çıxarmaq, xaric etmək

### Şüurlu oxu

**1** Aşağıdakı məlumatlar hansı abzaslarda əks olunub?

Bəzi xalqlar qurbağa ətindən yemək hazırlayırlar.
Qurbağadan qorxmağa dəyməz.
Qurbağa başqa heyvanları qorxutmaq üçün maye ifraz edir.
Qurbağa həşəratlarla qidalanır.

**2** Mətndə hansı suala cavab yoxdur?

A) Qurbağa nə ilə qidalanır?
B) Qurbağa ən çox hansı heyvandan qorxur?
C) Qurbağa düşmənlərindən necə qorunur?

QAYDALAR

## SAY BİLDİRƏN SÖZLƏR

Varlığın nə qədər olduğunu bildirmək üçün ad bildirən sözdən əvvəl say bildirən söz işlənir. Say bildirən sözlər *neçə?*, *nə qədər?* suallarına cavab verir. Məsələn:

*Atam bağda **beş** nar ağacı əkmişdi.*

Bu cümlədə "beş" sözü nar ağaclarının sayını bildirir.

Elə say bildirən sözlər var ki, varlığın sayını dəqiq göstərmir. Məsələn:

*Məktəbin həyatində xeyli adam toplaşmışdı.*

Bu cümlədə «xeyli» sözü adamların çox olduğunu bildirsə də, konkret sayını göstərmir.

Belə sözlər bəzən hərəkətə də aid ola bilər. Məsələn:

*Vüqar **çox** çalışdı, amma məsələni həll edə bilmədi.*

Bu cümlədə "çox" sözü Vüqarın nə qədər çalışdığını, yəni hərəkətin miqdarını göstərir.

Sözlük

***Qeyri-müəyyən*** – dəqiqləşdirilməmiş, konkret olmayan
***Miqdar*** – say

**1** Hansı tapmacada say bildirən sözlər daha çoxdur?

A

Altı inci, mirvari,
Üstü inci, mirvari,
Arasında bir yarpaq.

B

Bir küpüm var, saçaqlı,
Yeddicə deşiyi var:
Üçü cütdü, biri tək.

**2** Hansı cavab ikinci tapmacaya aiddir?

A) baş
B) dişlər və dil

**3** İkinci tapmacada "cüt deşiklər" və "tək deşik" dedikdə nə nəzərdə tutulur?

## QUYRUQ NƏYƏ GƏRƏKDİR?



Quyruq heyvanlara çox lazımdır.

Balıq üzəndə quyruğundan sükan kimi istifadə edir.

Quşlara isə quyruq havada qalmağa kömək edir.

Meymun üçün quyruq sanki daha bir əldir. O, quyruğu ilə hətta ağacdan meyvə də dərə bilir. Bəzi meymunlar quyruğunu ağac budağına bərk-bərk dolayıb sallaшır, sonra yellənərək ağacdan-ağaca tullanır.

Sincab isə budaqdan-budağa, ağacdan-ağaca tullanarkən iri, yumşaq quyruğundan paraşüt kimi istifadə edir.

İnək, at, camış quyruğu ilə milçəkləri qovur. İt isə sahibini görəndə sevincini quyruq bulamaqla bildirir.

### Sözlük

***Paraşüt*** – yüksəklikdən tullanmaq üçün çətirə oxşar qurğu

### Düşün və cavab ver

1. Ağacdələn öz quyruğundan necə istifadə edir? (Dərsliyin 87-ci səhifəsindəki "Ağacdələn" mətnini xatırla).

### Söz ehtiyatı

2. «Sanki» sözünü hansı sözlə əvəz etmək olar?
A) bəlkə B) elə bil C) yəqin

3. Milçəyi başqa cür necə adlandırırlar?
A) hörümçək b) birə c) çibin

### Dil qaydaları

4. Hansı heyvanın adını sətirdən-sətrə keçirmək olmaz?
A) inək B) meymun C) sincab

# FİLLƏR

Fil quruda yaşayan heyvanların ən böyüyüdür. Elə fillər var ki, hündürlüyü üç metr yarıma çatır.

Fil otyeyən heyvandır. Onu acıqlandırmasalar, heç kimə xətər yetirməz. Fillər meşələrdə, su qıraqlarında 10–20 başdan ibarət kiçik sürülərlə yaşayırlar.

Fil çox tez əhliləşir və insana alışır. Afrika və Hindistanın əhalisi fildən ağır işlərdə, səyahətdə, hətta müharibədə də istifadə edirdi.



Fil bir çox işləri xortumu ilə görür. Əslində, filin xortumu onun burnudur, sadəcə, çox uzundur. Xortumsuz filin işi çətin olardı. Boynu qısa olduğundan o, yerdən yem götürə bilmir. Xortumun köməyi ilə fil həm yemi götürüb ağzına aparır, həm də su içir. Onun iri xortumu o qədər həssasdır ki, xırda pulu da yerdən qaldırır. Filin xortumu on litrə qədər su tutur. Bundan başqa, xortum düşməndən qorunmaq üçün silah kimi də onun işinə yarayır.

Fil çox sədaqətlidir. Sürüdəki fillər bir-birinə yardım edir, zəifi atıb getmirlər. Fil öz sahibini də heç vaxt darda qoymur.

## Şüurlu oxu

**1** Fil haqqında hansı məlumat mətndə öz əksini tapmayıb?

A) Fil başqa heyvanları yemir.
B) Filin burnu çox uzundur.
C) Filin dişindən qiymətli əşyalar düzəldirlər.

**2** Hansı fikir mətndəki məlumatlarla ziddiyyət təşkil edir?

A) Fil xortumu ilə ağacdan alma dərə bilər.
B) Fili nə qədər döysələr də, sahibinə sədaqətlidir.
C) Suda yaşayan heyvanlar arasında fildən böyük olanı var.

## Söz ehtiyatı

**3** Göy rəngdə verilmiş "görür" sözünü hansı sözlə əvəz etmək olar?

A) yerinə yetirir B) baxır C) hiss edir

# XİLASKAR İT

Bəzən yanğın zamanı evdə qalan kiçik uşaqlar qorxudan bir küncə sıxılıb səslərini çıxarmırlar. Hər tərəfi tüstü bürüdüyündən onları tapmaq çətin olur. Belə hallarda yanğınsöndürənlər xüsusi xilaskar itlərdən istifadə edirlər.

Bir dəfə böyük bir evdə yanğın baş vermişdi. Yanğınsöndürənlər gələndə bir qadın ağlaya-ağlaya dedi ki, evdə onun 2 yaşlı qızı qalıb. Yanğınsöndürənlər özləri ilə gətirdikləri iti evə göndərdilər. İt pilləkənlə qalxıb tüstünün içində yox oldu. İki dəqiqədən sonra o, dişləri ilə balaca qızcığazın donundan tutaraq geri döndü. Ana qızını sağ-salamat görüb onu bağrına basdı.



İt yenə evə can atırdı. Yanğınsöndürənlər düşündülər ki, yəqin, evdə kimsə qalıb. İti buraxdılar. O, evə cumdu və tezliklə geri qayıtdı.

Adamlar itin bu dəfə nə gətirdiyini görəndə güldülər: xilaskar it ağzında böyük bir gəlincik tutmuşdu.

## Düşün və cavab ver

**1** İtlər haqqında deyilən fikirlərdən hansı səhvdir?

A) İtlər evi qoruyur.
B) İtlər sahibinə çox sədaqətlidir.
C) İt olan evdə siçan olmaz.
Ç) İtlərdən ov zamanı istifadə edirlər.

## Dil qaydaları

**2** Göy rəngdə verilmiş cümlədə “2” nəyin sayını bildirir?

A) qadının B) qızın C) yaşın

# PAPAQÇI VƏ MEYMUNLAR

Hindistanın ucqar kəndində bir papaqçı yaşayırdı. O, həsir papaqlar tikir, sonra da onları aparıb şəhərdə satırdı.

Bir gün səhər o, papaqları zənbilə yığıb şəhərə yola düşdü. Onun yolu qalın meşədən keçirdi. Papaqçı xeyli yol gedib yoruldu. Bir ağac dibində otluq yer tapıb uzandı ki, bir az dincəlsin. O dəqiqə də yuxuya getdi.

Sən demə, bu meşədə çoxlu meymun yaşayırmış. Papaqçının yatdığını görən meymunlar ağaclardan enib ona yaxınlaşdılar. Zənbili açıb papaqları götürdülər. Əcaib səslər çıxara-çıxara yenidən ağaclara dırmaşdılar.



Papaqçı səs-küyə oyandı, baxdı ki, meymunlar papaqların hamısını götürüblər, bircə öz başındakı papaq qalıb. O, hirsindən əl-qolunu oynada-oynada meymunları hədələdi:

– Yaramazlar! Qaytarın mənim papaqlarımı! Axı papaq sizin nəyinizə lazımdır?! Mən bu papaqları satıb pul eləməsəm, ailəm acından ölər.

Meymunlar onun səsinə səs verib çığırışdılar. Papaqçı yerdən bir budaq götürüb meymunlara tərəf *tolazladı.* Bunun cavabında meymunlar ağacdan əllərinə gələn meyvəni, budağı qoparıb ona atdılar.

Papaqçı qəzəbindən az qalırdı ağlasın. Nə edirdisə, meymunlar onun hərəkətini təkrarlayırdılar. Axırda o, papağını başından çıxarıb yerə çırpdı və bərkdən qışqırdı:



– Sizi görüm lənətə gələsiniz! Alın mənim papağımı da, gözünüzə soxun!

Elə bunu demişdi ki, bir də gördü meymunlar öz dillərində nə isə qışqırıb əllərindəki papaqları yerə atdılar. Papaqçı başa düşdü ki, meymunlar bayaqdan onun hərəkətlərini *yamsılayırmış*.

Sözlük

***Tolazlamaq*** – atmaq
***Yamsılamaq*** – təqlid etmək, oxşatmaq

Düşün və cavab ver

Meymunlar haqqında hansı məlumatlar bu mətndə əks olunub?

- Meymun, əsasən, ağacda yaşayır, budaqdan-budağa tullanmaqla hərəkət edir.
- Meymun quyruğunu ağac budağına dolayıb sallanır, əlləri ilə meyvə dərir.
- Meymun başqalarının hərəkətlərini təqlid etməyi xoşlayır.
- Hindistan meşələrində çoxlu meymun yaşayır.
- Meymunun bir neçə növü var.

## DOVŞANIN ADI



Canavar dovşanı necə qovmuşdusa, dovşanın adı yadından çıxmışdı. Bu vaxt onun qabağına bir kirpi çıxdı. Dovşan soruşdu:

– Kirpi, ay kirpi, bilmirsən, mənim adım nədir?

Kirpi dayanıb dərin fikrə getdi. _____ qabardıb dedi:

– Sənin adın Yekəqulaqdır.

Dovşan kirpiyə inanmadı. Heç belə də ad olar? Yekəqulaq! Birdən sincabı gördü.

– Səncə, mənim adım nədir? – deyə ondan soruşdu.



Sincab fikirləşmədən dedi:

– Çəpgöz! Gözlərin çəp olduğuna görə belə deyirlər.

Dovşan ona da inanmadı. Bir az da getmişdi ki, birdən kol dibində söhbət edən iki çaqqalın səsini eşitdi. Çaqqallardan biri o birinə deyirdi:

– Sən lap dovşansan ki! Ondan da qorxaqsan.

– Dovşan özünsən, – deyə o biri çaqqal cavab verdi.

Elə bu zaman dovşanın adı yadına düşdü:

– Dovşan! Əlbəttə, mənim adım dovşandır.

O sevinə-sevinə yoluna davam etdi.

### Şüurlu oxu

**1** Dovşan haqqında hansı məlumat mətndə əks olunmayıb?

A) Dovşanın qulaqları iri olur.

B) Dovşan qorxaq heyvandır.

C) Dovşanın çox güclü eşitmə qabiliyyəti var.

**2** Mavi rəngli zolağın yerinə hansı söz uyğun gəlir?

A) tüklərini B) gözlərini C) iynələrini

Düşün və cavab ver

**3** Təmsilin sonuna aşağıdakı cümlələrdən hansını artırardın?

A) Yol gedə-gedə dovşan öz-özünə fikirləşdi: “Adım aslan olsaydı, nə yaxşı olardı”.

B) Dovşan özünə söz verdi ki, bir daha adını unutmayacaq.

C) Dovşan sevinirdi, çünki hər kəsə öz adı əzizdir.

**4** Aşağıdakı tapmacaların hamısının cavabı dovşandır. Bu tapmacalarda dovşan haqqında bilmədiyin hansı yeni məlumatlar əks olunub?

1

Gözləri açıq yatar,
Güllə tək qaçmağı var.
Qulaqları yekədir,
Hər şeydən qorxmağı var.

2

Haçadır qulaqlarım,
Nazikdir ayaqlarım.
Qaçanda hoppanaram,
Kələmlə kökdür aram.

3

Kolları gəzər pusa-pusa,
Qıçları uzun, qolu qısa.

**5** 2-ci tapmacanın son misrasını necə izah edərdin?

A) Dovşan kələmi çox sevir.

B) Dovşan həm kələmi, həm də kökü çox sevir.

C) Dovşan kələmi kökdən üstün tutur.

Dil qaydaları

**6** 1-ci tapmacada qırmızı rəngdə verilmiş sözü hansı sözlə əvəz etmək ***olmaz***?

A) böyükdür B) enlidir C) iridir

**7** 3-cü tapmacada göy rəngdə verilmiş sözü hansı sözlə əvəz etmək olar?

A) yavaş-yavaş B) qorxa-qorxa C) güdə-güdə

**8** 3-cü tapmacada qırmızı rəngdə verilmiş sözlər:

A) yaxın mənalı sözlərdir.

B) əks mənalı sözlərdir.

C) eyni cür yazılan müxtəlif mənalı sözlərdir.



Düşmən əlinə keçən kərtənkələ xilas olmaq üçün quyruğunu qurban verir. Quyruq kərtənkələnin bədənindən qopub bir kənarda qalır. Qırılandan sonra da quyruq çabalamaqda davam edir və bir müddət düşmənin diqqətini yayındırır. Bu isə quyruq sahibinin təhlükəli yerdən qaçıb gizlənməsinə imkan yaradır. Amma kərtənkələ öz itkisi üçün o qədər də kədərlənmir. Çünki bir müddətdən sonra onun quyruğu bərpa olunur.

Şüurlu oxu

1 Mətnə ad qoy.

2 Mətndə "quyruq sahibi" dedikdə nə nəzərdə tutulur?

A) kərtənkələ
B) kərtənkələnin düşməni

Söz ehtiyatı

3 «Diqqətini yayındırır» əvəzinə nə demək olar?

A) ürəyini sıxır
B) canını alır
C) başını qatır

4 «Bərpa olunur» əvəzinə nə demək olar?

A) yenidən yaranır
B) parçalanıb dağılır
C) ölüb gedir

Dil qaydaları

5 Hansı sözdə "k" samiti "g" kimi tələffüz olunur?

A) kərtənkələ B) itki C) təhlükəli

6 Hansı sözün sonunda "q" samiti "k" kimi tələffüz olunur?

A) sadiq B) quyruq C) balıq

QAYDALAR **HƏRƏKƏT BİLDİRƏN SÖZLƏR**

Hərəkət bildirən sözlər *nə etmək?* sualına cavab verir. Hər bir hərəkət keçmişdə, gələcəkdə və ya indi baş verə bilər. Hərəkət bildirən sözün formasından bunu bilmək olur. Məsələn:

*Mən yay tətilini kəndimizdə* ***keçirdim.***

Bu cümlədə hərəkət keçmişdə baş verib.

*Mən yay tətilini kəndimizdə* ***keçirirəm.***

Bu cümlədə hərəkət indi baş verir.

*Mən yay tətilini kəndimizdə* ***keçirəcəyəm.***

Bu cümlədə hərəkət gələcəkdə baş verəcək.

**1** Hansı cümlədə hərəkət keçmişdə baş verib?

A) Anar riyaziyyatı yaxşı bilir.
B) Biz bir yerdə dərsə hazırlaşdıq.
C) Mən daha onunla bir yerdə hazırlaşmayacağam.

**2** Hansı bənddə əks mənalı hərəkət bildirən sözlər verilib?

A) dinləmək – qulaq asmaq
B) dalaşmaq – savaşmaq
C) aparmaq – gətirmək

**3** Hansı bənddə hərəkət bildirən söz saydan yaranıb?

A) birləşmək
B) pisləmək
C) güləşmək

**4** Bu şəkillərin adlarını elə tələffüz et ki, hərəkət bildirən söz olsun.





Əlamətlərin aid olduğu heyvan və quşları tapın.

| | | | |
|---|---|---|---|
| 1 | sədaqətli | A | qartal |
| 2 | qorxaq | B | tülkü |
| 3 | sülhpərvər | C | fil |
| 4 | vüqarlı | Ç | dəvə |
| 5 | hiyləgər | D | dovşan |
| 6 | kinli | E | göyərçin |

## QIRXAYAQ

Qırxayaq yolla gedirdi. Sərçəyə rast gəldi. Gördü ki, sərçə iki ayağı ilə gəzir. Qırxayaq da iki ayağı ilə yeriməyə başladı. Sonra qarışqaya rast gəldi və ___ ayağı ilə yeriməyə cəhd etdi.

Nəhayət, anasını görəndə sevinclə qışqırdı:

– Mən ki qırxayağam!

Bunu deyib o, qırx ayağı ilə də anasının üstünə yüyürdü.

*Tofiq Ağayev*

**1** Hansı fikir mətnin ideya məzmununa uyğun gəlir?

A) Adam ayağını yorğanına görə uzadar.
B) Halva-halva deməklə ağız şirin olmaz.
C) Hərə öz yerişini yeriməlidir.

**2** Mətndə mavi rəngli zolağın yerinə hansı söz uyğun gəlir?

A) üç B) altı C) doqquz

**3** "Qırxayaq" sözü:

A) ad bildirir
B) say bildirir
C) hərəkət bildirir

**4** Hansı canlının adı iki sözdən ibarətdir?

A) sərçə B) qırxayaq C) qarışqa

**5** Hərəkət bildirən hansı sözlər eyni mənalıdır?

A) gəzmək, yerimək
B) rast gəlmək, cəhd etmək
C) qışqırmaq, yüyürmək

BÖLMƏ
5

# TƏBİƏTİN SİRLƏRİ

- Mürəkkəb sözlər
- Mürəkkəb sözlərin yazılışı
- Kök və şəkilçi
- Düzəltmə sözlər



# ANA TƏBİƏTİN UŞAQLARA MƏKTUBU

Əziz balalar!

Bilin və *agah olun* ki, Yer üzündə bütün canlılar mənim balalarımdır. Ona görə də mənə Ana Təbiət deyirlər.

Siz, yəqin ki, hər səhər durub güzgüyə baxırsınız və orada özünüzü görürsünüz. Mən də tez-tez güzgüyə baxıram. Bilirsiniz, orada nələr görürəm? Meşədə gəzən heyvanları, göydə qanad çalan quşları, suda üzən balıqları, yer altında yuva quran qarışqaları... Bəli, bunlar hamısı mənəm – Ana Təbiətdir.

Yer üzündəki bütün canlılar bir böyük ailədir. Mənim ailəmdir. Ancaq son vaxtlar bir çox heyvanlar, quşlar mənə şikayət edirlər. Deyirlər ki, insanlar onları incidirlər – ağacları kəsir, odlu silahlarla heyvanları öldürür, suları zəhərləyib balıqları məhv edirlər.

Ola bilsin, bu insanlar bilmirlər ki, həmin canlılar onların bacı-qardaşlarıdır. Bəlkə də, onlar elə düşünürlər ki, Ana Təbiət çox böyükdür. Bir neçə canlını öldürməklə ona heç nə olmaz.

Elə deyil!

Baxın, sizin barmağınıza kiçik bir tikan batanda çox ağrıdır, eləmi? Yer üzündə bir insan kiçik qarışqa yuvasını tapdalayanda mənim bədənim də elə ağrıyır.

İnsanları başa salın. Deyin ki, mən onların eviyəm. Adam yaşadığı evi çirkləndirməz, bacı-qardaşını incitməz. Çünki bu evdən başqası yoxdur və o, həmişə sizin olacaq.

Balalarıma qarşı dərin sevgi və məhəbbətlə

**ANA TƏBİƏT**

## Sözlük

***Agah olmaq*** – bilmək, xəbərdar olmaq

## Düşün və cavab ver

1. İnsanların hansı hərəkətləri Ana Təbiəti narahat edir?
2. Ana Təbiət uşaqlardan hansı köməyi umur?
3. Səncə, nəyə görə bu mətndə “Təbiət” sözü böyük yazılır?

## GÜNƏBAXAN



Siz bilirsinizmi, niyə bu bitkiyə günəbaxan deyirlər? Çünki o, həmişə günəşə tərəf boylanır.

Günəbaxan çox faydalı bitkidir. Onun qovrulmuş toxumlarını həm böyüklər, həm də uşaqlar sevirlər. Bu toxumlardan yağ da hazırlayırlar. Günəbaxan yağı vitaminlə *zəngin* olur.

## AYABAXAN

Göstərdi nəvəsinə
günəbaxanı.
Qız dedi: "Söylə mənə,
Ayabaxan bəs hanı?"

*Mir Sabir*



### Sözlük

***Zəngin*** – çoxlu, bol, varlı

### Düşün və cavab ver

1. "Günəbaxan" və "Ayabaxan" mətnlərindən hansı şeirdir?

2. "Ayabaxan" mətnində mavi zolağın yerinə hansı söz olmalıdır?
   A) ata   B) baba   C) dayı

3. "Günəbaxan" mətnində hansı suala cavab yoxdur?
   A) Bu bitki niyə belə adlanır?
   B) Günəbaxanı necə yetişdirirlər?
   C) Günəbaxanın toxumundan nə üçün istifadə edirlər?

4. "Günəbaxan" adının tərkibində hansı sözlər var? Onlardan hansı ad, hansı hərəkət bildirir?

## İPƏKQURDU



Təbiətdə cürbəcür qurdlara rast gəlmək olar. Onların arasında insanlara xeyir verənləri də var. Belələrindən biri də ipəkqurdudur.

Əslində, ipəkqurdu qurd deyil, kəpənəkdir. İnsanlar bu kəpənəyin toxumlarını xüsusi qutularda saxlayırlar. Toxumlardan kiçik qurdlar – tırtıllar əmələ gəlir. Tırtılı tut yarpağı ilə yemləyirlər. İpəkqurdu tırtılı nazik ipək tellər ifraz edir. O, tellərdən öz ətrafında “barama” deyilən yumru qutucuq hörür. Barama toyuq yumurtasından balaca olur. İpəkqurdu tırtılı baramanın içində böyüyüb kəpənəyə çevrilir. Sonra baramanı deşib bayıra çıxır.

İnsanlar baramanı açıb sap düzəldirlər. Bu sapdan ipək parça toxunur.

### Doğru, yoxsa yanlış

**1** İpəkqurdu nə ilə qidalanır?
A) üzüm yarpağı ilə
B) tut yarpağı ilə

**2** Barama nədir?
A) ipəkqurdunun balası
B) ipəkqurdunun hördüyü evcik

**3** Tırtıl nədir?
A) təzəcə yeriməyə başlayan qurd
B) ipək sap

### Düşün və cavab ver

**4** Aşağıdakı sxemi izah et və mətn qurub danış.




### Dil qaydaları

**5** “İpəkqurdu” sözünün tərkibində hansı sözlər var?

QAYDALAR **MÜRƏKKƏB SÖZLƏR**

Elə sözlər var ki, iki sözdən ibarətdir. Məsələn, *Qarabağ* sözünün tərkibində iki söz var: *qara* və *bağ.*

Belə sözlərə mürəkkəb sözlər deyilir.

**1** Bu sözlərdən hansılarını "qara" sözünə artıranda mürəkkəb söz yaranır?

*göz, məktəb, bəniz, mal, qələm*

**2** Hansı mürəkkəb sözdür?

A) gündəlik
B) şəhərlər
C) yarımada

**3** Hansı mürəkkəb sözdə əlamət və ad bildirən sözlər var?

A) dəvəquşu B) qısaqol C) daş-kəsək

**4** Hansı mürəkkəb söz yaxın mənalı sözlərin birləşməsindən yaranıb?

A) qayda-qanun B) sarıbəniz C) gec-tez

Bir çox bitkilər var ki, onlardan dərman kimi istifadə olunur. Belə bitkilərdən biri də itburnudur. İtburnu kolu, əsasən, qayalıqlarda, alçatmaz yerlərdə bitir. Onun meyvəsindən bir çox xəstəliklərin müalicəsində istifadə olunur.



**5** "İtburnu" sözü hansı sözlərdən ibarətdir?

**6** Mətndə mavi rəngdə verilmiş hansı söz mürəkkəbdir?

A) istifadə B) alçatmaz C) xəstəliklərin



# HÖRÜMÇƏKLƏR

Yəqin ki, havadan asılıb qalmış hörümçək görmüsünüz. Adama elə gəlir ki, o uçur. Əslində, hörümçək uçmur, nazik teldən yapışıb sallanır. Bu tel o qədər nazikdir ki, bəzən onu gözlə görmək olmur. Hörümçək bu telin bir ucunu tavana yapışdırır. Aşağı-yuxarı hərəkət eləmək üçün teldən nərdivan kimi istifadə edir.

Hörümçəyin qarnında maye ifraz edən vəzilər var. Bu maye havaya çıxan kimi bərkiyib telə çevrilir. Həmin tellərin hörümçək üçün böyük əhəmiyyəti var. O, tellərdən ____ hörür. Tora cücü düşən kimi onun başının üstünü alır, zəhərli çənəsi ilə onu öldürüb yeyir.

Hörümçək öz tellərindən nəsil artırmaq üçün də istifadə edir. O, tellərdən barama hörüb ora yumurta qoyur. Bir azdan bu evcikdə hörümçək balaları əmələ gəlir.

Hörümçək havanın necə keçəcəyini əvvəlcədən bilir. Belə deyirlər ki, əgər çay qırağında yaşayan hörümçək torunu çox hündürdə qurursa, deməli, yazda güclü sel olacaq.

Hörümçəyin müxtəlif növləri var. Onlar zərərli həşəratları öldürməklə təbiətə xeyir verirlər. Lakin elə iri hörümçəklər də var ki, onların zəhəri nəinki insanı, hətta atı və dəvəni də öldürə bilir.

## Şüurlu oxu

1. Mətndə mavi boşluğun yerinə hansı söz uyğun gəlir?
   A) saç B) tor C) divar

2. Mətndə hansı suala cavab yoxdur?
   A) Hörümçək nə ilə qidalanır?
   B) Hörümçək öz telindən hansı məqsədlərlə istifadə edir?
   C) Hörümçəyin neçə ayağı var?

3. Hansı fikir doğrudur?
   1. İpəkqurdu və hörümçək barama hörürlər.
   2. İpəkqurdu və hörümçək kiçik həşəratlarla qidalanırlar.
   3. İpəkqurdu və hörümçəyin baramasından ipək alınır.

4. Mavi rəngdə verilmiş ifadəni hansı sözlə əvəz etmək olar?
   A) tanış olur B) yaxalayır C) qırxır

QAYDALAR **MÜRƏKKƏB SÖZLƏRİN YAZILIŞI**

Mürəkkəb sözlər bitişik və ya defislə yazıla bilər.

balıq + qulaq = balıqqulağı (bitişik yazılır)
dərə + təpə = dərə-təpə (defislə yazılır)

Aşağıdakı hallarda sözlər arasında defis qoyulur:

Yaxın mənalı sözlər birləşdikdə: adət + ənənə = adət-ənənə

Əks mənalı sözlər birləşdikdə: böyük + kiçik = böyük-kiçik

Sözlər təkrar olunduqda: tez + tez = tez-tez

1. Hansı mürəkkəb sözdə yaxın mənalı sözlər birləşib?
   A) irili-xırdalı
   B) gül-çiçək
   C) kağız-kuğuz

2. Hansı mürəkkəb sözdə əks mənalı sözlər birləşib?
   A) qaça-qaça
   B) qayda-qanun
   C) baş-ayaq

3. Hansı sözlər birləşəndə mürəkkəb söz defislə yazılır?
   A) söz, söhbət
   B) tava, kabab
   C) soyuq, qanlı

4. Hansı sözlər birləşdikdə bitişik yazılır?
   A) birdən, birə
   B) ana, bala
   C) kəklik, ot

5. Hansı söz təkrar olunmaqla mürəkkəb söz yarada bilər?
   A) qələm B) yavaş C) dünən

# QIZIL NƏDİR?



Payız gələndə
Yarpaq qızıldır.
Xəzəl görəndə
Torpaq qızıldır.

Əkinçi deyir:
– Qızıl çöldədir.
Balıqçı deyir:
– Qızıl göldədir.



Düşün və cavab ver

1. «Yarpaq qızıldır», «torpaq qızıldır» sözlərində "qızıl" sözü hansı mənanı bildirir?
2. Əkinçi «qızıl çöldədir» deyəndə nəyi nəzərdə tutur?
3. Bəs balıqçı «qızıl göldədir» deyəndə nəyi nəzərdə tutur?
4. «Qara qızıl», «ağ qızıl» nəyə deyilir? Niyə belə deyirlər?
5. «Qızıl xasiyyət» ifadəsini necə başa düşürsən?
6. "Qızıl üzük" və "qızıl ürək" ifadələrində "qızıl" sözünün mənaları arasındakı fərqi izah et.
7. Çərçivədə verilmiş sözlərdən istifadə etməklə aşağıdakı ifadələrdə «qızıl» sözünün mənalarını tap.

| *metal, qiymətli, bərəkətli, sarı* |
|---|

qızıl söz, qızıl saat, qızıl payız, qızıl torpaq

Test

8. Hansı metal adı "iradə" sözü ilə birgə işləndikdə "möhkəm, əyilməz" mənasını verir:

A) gümüş B) polad C) mis

# ÇAYIN GİLEYİ

Kiçik çay uzun illər idi ki, bir gölə axırdı. Bu göl çayın sularını acgözlüklə udurdu. Çay isə uzaqlara axıb getmək istəyirdi, amma arzusu həmişə ürəyində qalırdı.

Bir gün o, gölə dedi:

– Sən çox acgözsən. Mən yaz-qış, gecə-gündüz sənin qarnına axıram, heç doymaq bilmirsən. Sən doysan, mən axıb lap uzaqlara gedərəm.

Göl cavab verdi:

– Sən məni o qədər də acgöz bilmə. Mən öz suyumdan günəşə pay verirəm ki, yağış yağdırsın.

– O, yağışı necə yağdırır ki?

– Günəş mənim suyumu buxarlandırıb havaya qaldırır. Buxar isə göylərdə soyuyub yağışa çevrilir və yerə tökülür.

Çay acıqlı-acıqlı:

– Vermə suyunu günəşə, – dedi.

– Axı onda yağış yağmaz.

– Qoy yağış yağmasın.

Göl gülüb dedi:

– Axı onda çaylar quruyar.

Çay fikrə getdi. O, hər şeyi başa düşdü və həmin gündən səsini çıxarmadan sakit-sakit gölə axmağa davam etdi.

*Əli Səmədli*



Düşün və cavab ver

1. "Giley" sözünü hansı sözlə əvəz etmək olar?
   A) xəbər B) kədər C) şikayət
2. Çay nədən gileylənirdi? O, haqlı idimi?
3. Azərbaycanda olan hansı çayları və gölləri tanıyırsan? Kür çayı axıb hara tökülür?

QAYDALAR **KÖK VƏ ŞƏKİLÇİ**

Aşağıdakı cümlələrdə “məktəb” sözünə diqqət yetirin.

*Ayxan məktəbdən çıxıb evə yollandı.*
*Məktəblər bilik yarışına qoşuldular.*
*Məktəbimizdə zəngin kitabxana var.*

Altından xətt çəkilmiş sözlərdə *“məktəb”* sözün köküdür. Çünki onun mənası var və ayrıca da işlənə bilər: *Məktəb bizim təhsil aldığımız yerdir.*

Ona qoşulan hissəciklər isə (*-dən, -lər, -imiz, -də*) şəkilçi adlanır. Şəkilçi sözün kökündən ayrı işlənmir. Ayrılıqda onun mənası olmur. Sözün kökünə eyni zamanda bir neçə şəkilçi qoşula bilər: *kitab-lar-ımız-ın səhifə-lər-i.*

**1** Yuxarıda “kök” sözünün hansı mənasından danışılır?

A) ağacın torpaq altında olan hissəsi
B) şişman, gonbul
C) sözün dəyişməyən və mənası olan hissəsi
Ç) sarı-qırmızı rəngli kökü yeməli bitki

**2** “*Dam... altında qaranquş yuva qurmuşdu*” cümləsində nöqtələrin yerinə hansı şəkilçini artırmaq lazımdır?

A) -dan B) -ın C) -dır

**3** “*Zooparkdakı heyvan* **1** *dan ən məzəli* **2** *meymun idi*” cümləsində nömrələnmiş boşluqlara hansı şəkilçiləri artırmaq lazımdır?

A) 1 -lar, 2 -si
B) 1 -ın, 2 -lər
C) 1 -da, 2 -dır

**4** Hansı bənddə “şəhərimizdə” sözü kök və şəkilçilərə düzgün ayrılıb?

A) şəhər-imi-zdə
B) şəhə-ri-miz-də
C) şəhər-imiz-də

# QARIŞQALAR

I MƏTN

## FİL VƏ QARIŞQA



Göyün yüksəkliyində bir sarı yarpaq uçurdu. Onun üstündə balaca qarışqa var idi. Qarışqa aşağı baxıb yerdə fili gördü. Bərkdən qışqırdı:

– Necə də balaca fildir!

Qarışqa yerə enəndə filə baxıb gözlərinə inanmadı:

– Sən ki bapbalaca idin?!

– Sən göydən yerə enənə kimi mən böyümüşəm, – deyə fil qəhqəhə çəkdi.

*Tofiq Ağayev*



Düşün və cavab ver

1. Göydəki ay böyükdür, yoxsa yaşadığın bina?
2. Göydəki ulduz sənin cibinə yerləşərmi?
3. Yarpağın uçması ilə quşun uçması arasında nə fərq var?
4. Doğrudanmı, qarışqa yerə enənə qədər fil böyümüşdü?
5. Qarışqa göydən baxanda fil ona niyə balaca görünürdü?

Dil qaydaları

6. Bu sözlərdən hansı yazıldığı kimi tələffüz olunmur?
   A) fil  B) yarpaq  C) qarışqa
7. Hansı daha böyükdür: balaca, yoxsa bapbalaca?

## II MƏTN QARIŞQALAR NİYƏ AZMIR?



Qarışqalar yemək tapmaq üçün uzaq səfərlərə çıxırlar. Bəs necə olur ki, geri qayıdanda onlar öz yuvalarını tapa bilirlər?

Bunun səbəbi qarışqaların iy bilməsidir. Qarışqa bir yana gedəndə ləpirinin iyi yolda qalır. Yuvaya qayıdanda o, həmin iyi tutub gedir və heç zaman azmır.

Qarışqanın keçdiyi yoldan torpağın bir hissəsini götürüb qırağa atın. Görəcəksiniz ki, o, həmin yerdə dayanıb öz ləpirinin iyini axtarır. Tapandan sonra yoluna davam edəcək.

Düşün və cavab ver

**8** Qarışqaların hansı xüsusiyyəti onlara yolu düzgün təyin etməyə imkan verir?

A) eşitmə B) iybilmə C) dadbilmə

## III MƏTN SƏRKƏRDƏ VƏ QARIŞQA

Bir sərkərdə döyüşdə məğlub olub ruhdan düşdü. Gəlib qayalıqda oturdu, fikrə daldı. Bu vaxt gördü ki, bir qarışqa belində buğda dənəsi yuxarı dırmaşır. Yuxarıda qarışqanın yuvası var idi.

Daş sürüşkən idi. Qarışqa yolun yarısına çatmamış sürüşüb yerə düşdü. Lakin o, yükünü yenidən belinə qaldırdı və yuvasına doğru irəlilədi. Amma yenə sürüşüb düşdü. Qarışqa düz otuz doqquz dəfə sürüşüb düşdü. Nəhayət, qırxıncı dəfə buğdanı yuvasına çatdırdı.

Bunu görən sərkərdə öz-özünə düşündü: “Qarışqa otuz doqquz dəfə yıxıldı, ancaq istəyindən dönmədi. Bəs niyə mən bir dəfə məğlub olan kimi ruhdan düşürəm?..”

Düşün və cavab ver

**9** Qarışqa haqqında aşağıdakı məlumatlar hansı mətnlərdə verilib?

Qarışqanın güclü iybilmə qabiliyyəti var.
Qarışqa çox zəhmətkeşdir.
Qarışqa çox kiçik həşəratdır.

# GÜNƏŞ VƏ BULUD

Günəş öz odlu arabasında göy üzündə səyahətə çıxmışdı. O, şən və vüqarlı idi, şüalarını səxavətlə hər tərəfə səpələyirdi.

Ətrafdakılar da şən idilər. Təkcə bulud hirsli-hirsli günəşə baxaraq söylənirdi:

– Çox bədxərcsən! Səpələ, səpələ işığını! Görək axıra nəyin qalacaq!

Üzümlüklərdə isə hər bir üzüm giləsi günəşin şüasını udub sevinirdi. Elə bir ot, böcək, çiçək yox idi ki, günəşdən öz payını almasın.

– Hə, payla öz şüalarını, payla, – bulud heç cür sakitləşə bilmirdi. – Dağıt öz dövlətini. Bir gün verməyə heç nəyin qalmayacaq. Onda baxarıq, görək onlar sənə necə təşəkkür edəcəklər!

Günəş isə göydə fərəhlə diyirlənərək şüalarını paylamaqda davam edirdi.

Batmaq vaxtı gələndə günəş şüalarını saydı və məlum oldu ki, onların hamısı, hətta ən kiçiciyi də öz yerindədir!

Bundan xəbər tutan bulud elə təəccübləndi ki, elə oradaca yağışa çevrilib yerə töküldü.



## Düşün və cavab ver

**1** Aşağıdakı əlamətlərdən günəşin və buludun xarakterinə uyğun olanları seç.

*mehriban, paxıl, rəhmdil, şən, xəbis, səxavətli*

**2** Yerdəki canlıların günəşdən aldığı pay nədir?

**3** Göy rəngdə verilmiş cümləni necə izah etmək olar?

A) Adam hər axşam gün ərzində xərclədiklərini saymalıdır.

B) Xeyirxahlıq bitib-tükənməz keyfiyyətdir. Ona görə də hamıya xeyirxahlıq etməkdən çəkinmək lazım deyil.

# ARI

Arıyam, zəhmətkeşəm,
Bal, *mum* çəkməkdir peşəm.
Səhər güllər açınca,
Gözəl qoxu saçınca
Uçaram göy yamaca,
Çiçək açmış ağaca,
Ya çəmənə, meşəyə,
Qonaram hər çiçəyə.
Şirəsini çəkərəm,
__________________.
Çalışaram doqquz ay,
Hamı məndən alar pay.
Balımdan qoy yesinlər,
Mənə sağ ol desinlər.

*Abdulla Şaiq*



### Sözlük

***Mum*** – bal arısının şan düzəltmək üçün istifadə etdiyi maddə
***Şan*** – pətəyin bal saxlamaq üçün gözcükləri

### Düşün və cavab ver

1. Niyə arı ildə cəmi doqquz ay çalışır?

2. Şeirdəki mavi rəngdə boşluğun yerinə hansı misra uyğun gəlir?
   A) Pətəyimə tökərəm.
   B) Ləçəkdən ev tikərəm.
   C) Yarpağını yeyərəm.

3. Aşağıdakı misralarda hansı söz şeirdəki kimi deyil?
   *Arıyam, zəhmətkeşəm,*
   *Bal, su çəkməkdir peşəm.*
   A) arıyam B) peşəm C) su

4. Şeirdəki "qoxu" sözünü hansı sözlə əvəz etmək olar?
   A) iy B) ataş C) ətir

# BAL ARISININ AİLƏSİ



Bal arıları ailə şəklində yaşayır. Bu ailədə hərənin öz işi, öz vəzifəsi var.

Arı ailəsində minlərlə arı yaşayır. Lakin ana arı bircə dənə olur. Onun əsas vəzifəsi dünyaya yeni balaca arılar gətirmək və onları bəsləyib boya-başa çatdırmaqdır.



Kəşfiyyatçı arı gedib çölü-çəməni gəzir və pətəyə – ailənin evinə qayıdır. O, özü ilə çiçəklərin ətrini gətirir və çəmənliyin yerini işçi arılara nişan verir. İşçi arılar həmin yerlərə uçur, çiçəklərdən *nektar* toplayır və onu [ 1 ] çevirib [ 2 ] doldururlar.



Ailədə keşikçi arılar da olur. Onlar pətəyi düşmənlərdən qoruyurlar. Onların bir başqa vəzifəsi də tənbəllik edən işçi arıları cəzalandırmaqdır. Keşikçi arılar çölü-çəməni boş-boş gəzib geriyə balsız dönən işçi arıları pətəyə yaxın qoymurlar.

## Sözlük

***Nektar*** – çiçəklərin şəkərli şirəsi

## Şüurlu oxu

**1** Mətndəki boşluqların yerinə hansı sözlər uyğun gəlir?

A) 1– pətəyə, 2 – şana
B) 1– meyvəyə, 2 – qarınlarına
C) 1 – bala, 2 – şana

**2** Arı ailəsində belə arı olmur:

A) işçi arı
B) ana arı
C) ata arı
Ç) keşikçi arı

# KƏPƏNƏKLƏR



**1** Kəpənəklərin çoxu çiçəyin şirəsi ilə qidalanır. Bəzi kəpənəklər çox ağır olduğundan çiçəyə qonmur. Qanadlarını tez-tez titrədərək vertolyot kimi havadan asılı qalır, xortumunu uzadıb çiçəyin şirəsini sorur.

**2** Kəpənəyin çox güclü iybilmə qabiliyyəti var. O, uzaq məsafədən yoldaşını iyləyib tapır. Kəpənək iyi bığları vasitəsilə hiss edir.

**3** Kəpənək kələmin və ya turşəngin (quzuqulağı) üstünə yumurtalar qoyur. Bu yumurtalardan kəpənək balaları çıxır. Balalar həmin bitkilərlə qidalanırlar. Kəpənək bitkiləri də iyinə görə tapır.

**4** Bəzi kəpənəklər yalnız gecələr uçur. Onlara pərvanə də deyirlər. Pərvanə hər zaman işığa gəlir. Bəzən oda o qədər yaxınlaşır ki, özünü yandırır. Ona görə də pərvanə *fədakarlıq* və məhəbbət rəmzi sayılır.

## Sözlük

***Fədakarlıq*** – var gücü ilə çalışmaq, çox böyük səy göstərmək, özünü nəyinsə yolunda qurban vermək

## Düşün və cavab ver

**1** Kəpənəklə arının hansı oxşar və fərqli cəhətləri var?

**2** Aşağıdakı suallara hansı abzaslarda cavab var?
- Kəpənək necə balalayır?
- Kəpənək necə qidalanır?
- Kəpənək qoxunu nəyin vasitəsilə hiss edir?
- Nəyə görə gecə kəpənəkləri fədakarlıq rəmzi sayılır?

**3** Hansı fikir mətnin məzmununa uyğun gəlir?

A) Kəpənək çiçəyin şirəsini sorub bal hazırlayır.
B) Kəpənəyin güclü eşitmə qabiliyyəti var.
C) Gecə kəpənəyi pərvanə adlanır.

# QARANQUŞLAR



Qaranquş köçəri quşdur. Payızda uçub isti ölkələrə gedir, bir də yazda qayıdıb gəlir. Qaranquşların uçuşuna baxan elə bilər ki, onlar, sadəcə olaraq, havada süzürlər. Əslində isə qaranquş durmadan işləyir, həşərat tutur.

El arasında deyirlər ki, qaranquş alçaqdan uçursa, deməli, hava yağışlı olacaq. Məsələ burasındadır ki, yağışdan qabaq hava bir az nəmişlik olur. Həşəratın qanadı islanıb şişir, onu aşağıya doğru çəkir. Həşəratla qidalanan qaranquş da məcbur olub aşağıdan uçur.

Qaranquş həşəratları havada tutur. Həm özünü, həm də balalarını doyurmaq üçün o, çox həşərat tutmalıdır! Ona görə də qaranquşun bütün günü havada keçir. O, tək-tək halda yerə enir, çünki yerdə çətinliklə gəzir.

Şüurlu oxu

**1** Mətndə hansı suala cavab yoxdur?

A) Qaranquşun alçaqdan uçması nəyin əlamətidir?
B) Qaranquş yuvasını harada qurur?
C) Qaranquş nə ilə qidalanır?

Düşün və cavab ver

**2** Əgər qaranquş köçəri quşdursa, niyə yuva qurur?

Söz ehtiyatı

**3** 2-ci abzasda göy rəngdə verilmiş sözü hansı sözlə əvəz etmək olar?

A) soyuq B) isti C) rütubətli

Dil qaydaları

**4** Hansı sözdə *-lar* şəkilçisi yazıldığı kimi tələffüz olunur?

A) budaqlar B) quşlar C) həşəratlar

QAYDALAR **DÜZƏLTMƏ SÖZLƏR**

Elə şəkilçilər var ki, sözə qoşulduqda yeni mənalı söz yaranır. Belə sözlər ***düzəltmə sözlər*** adlanır.

Diqqət yetirin:

*Selcan gülləri qoymaq üçün güldan gətirdi.*

Bu cümlədə kökü *gül* olan iki söz var. Birincidə sözün kökünə *-lər* və *-i* şəkilçiləri qoşulub, lakin sözün mənası dəyişməyib. İkincidə sözün kökünə *-dan* şəkilçisi qoşulub və yeni mənalı söz yaranıb.

Müqayisə edin:

**Gül** – çiçək

**Güldan** – gül qoymaq üçün qab, gülqabı

**1** Şəkilçiləri müvafiq sözlərə artırmaqla yeni sözlər düzəlt.

| | |
|---|---|
| balıq | -cıl |
| məktəb | -lik |
| zarafat | -li |
| təmiz | -çı |

**2** Hansı sözə *-daş* şəkilçisi artırdıqda "yaxın dost" mənasını verən söz yaranır?

A) vətən B) sirr C) əmək

**3** "*Kitabxana*", "*xəstəxana*" sözlərində *-xana* şəkilçisi sözün mənasını necə dəyişdirib?

A) Əlamət bildirən söz əmələ gətirib.
B) Peşə, sənət bildirən söz əmələ gətirib.
C) Yer, məkan bildirən söz əmələ gətirib.

**4** Hansı bənddə ad bildirən sözdən əlamət bildirən söz yaranıb?

A) duz – duzlu
B) vur – vuruş
C) dalaş – dalaşqan

# GÜLLƏRDƏN GÖYÇƏK ÇİÇƏK

Bir gün səhər Çiçək güllü paltarını geyindi, başına alabəzək bant bağladı və babasının yanına getdi.

Çiçəyin babası gülçü idi, bağda işləyirdi. Çiçək güllükdə gizlənib babasını səslədi. Baba səs gələn tərəfə baxdı, amma güllərin arasında nəvəsini seçə bilmədi.

Çiçək gizləndiyi yerdən çıxıb babasının boynuna atıldı:

– Mən buradayam!

Baba fərəhlə nəvəsini qucaqlayıb dedi:

– Ay mənim Çiçək balam, güllərdən göyçək balam!



Şüurlu oxu

1. Baba niyə güllərin arasında nəvəsini görə bilmədi?
   A) Çünki nəvəsinin adı "Çiçək" idi.
   B) Çünki qızın paltarı güllərdən seçilmirdi.
   C) Çünki axşam olduğundan baba yaxşı görmürdü.

Dil qaydaları

2. Mətndə mavi rəngdə verilmiş hansı söz düzəltmə deyil?
   A) güllü B) gülçü C) güllük D) güllərin

3. Hansı sırada düzəltmə söz səhvdir?
   A) Çəkməçi çəkmə tikir.
   B) Xörəkçi xörək bişirir.
   C) Odunçu odun yarır.

# CIRCIRAMA



1 Yəqin ki, siz isti yay günlərində çəmənlikdə cırcırama səsi eşitmisiniz. Çoxları elə bilir ki, o da quş kimi oxuyur. Amma belə deyil. Cırcırama öz möhkəm qanadlarını bir-birinə sürtməklə səs salır.

2 Cırcırama dünyanın ən qarınqulu böcəyidir. Elə cırcırama var ki, iki saatda qırx milçək yeyir. Ziyanverici həşəratları məhv etməklə o, təbiətə xeyir verir.

3 Cırcıramanın səsini çoxları eşidib, amma özünü az adam görüb. Çünki o, bütün gününü uçuşda keçirir, bir saatda yüz kilometr uça bilir. Bir neçə saniyə ərzində cırcırama aşağıda, yuxarıda, sağda, solda ola bilir.

4 Onun gözlərinin quruluşu çox maraqlıdır. Hər gözündə çoxlu balaca gözcüklər var. Bu gözcüklərin hərəsi bir şeyi görür. Biri uzağı, biri yaxını, biri yuxarını, biri aşağını, başqa birisi də rəngi seçir. Bu cür görmə qabiliyyəti ona balaca həşəratları tez tapıb ovlamaqda kömək edir.

5 Çox qəribədir ki, cırcıramalar nəsil artırmaq üçün yumurtalarını suya qoyur. *Sürfələr* suda böyüyür. Onlardan yeni cırcıramalar yaranır.

## Sözlük

***Sürfə*** – yumurtacıqdan yenicə çıxmış həşərat

## Şüurlu oxu

**1** Bu suallara hansı abzaslarda cavab var?

- Niyə cırcıramanı görmək olmur?
- Cırcırama nə ilə qidalanır?
- Cırcırama necə səs salır?
- Cırcırama necə balalayır?
- Necə olur ki, cırcırama az müddətdə çoxlu həşərat tutur?

Dil qaydaları

2 Göy rəngdə verilmiş sözlərdən hansının mürəkkəb, hansının düzəltmə söz olduğunu müəyyən et.

## ƏQRƏB VƏ QURBAĞA

Əqrəb çayı keçmək istəyirdi. Ancaq üzə bilmədiyinə görə suya girməyə qorxurdu. Birdən yaxında bir qurbağa gördü. Onu çağırıb dedi:

– Qurbağa qardaş, kömək elə, çayı keçim.

Qurbağa tullana-tullana yaxın gəldi. Əqrəbi belinə mindirib çayın o biri tərəfinə üzməyə başladı. Çayın ortasına çatanda əqrəb dilləndi:

– Qurbağa qardaş, mən gərək səni sancım.



Qurbağa başladı yalvarmağa:

– Ay əqrəb, axı mən sənə kömək elədim. Bəs yaxşılığın əvəzini belə çıxarlar?

Əqrəb cavabında dedi:

– Bağışla, qurbağa qardaş. Ancaq bu, mənim adətimdir. Kimin ki boynuna mindim, gərək onu sancım.

Qurbağa nə qədər yalvardısa, xeyri olmadı. Axırda dedi:

– Yaxşı, sən deyən olsun. Ancaq bil ki, mənim də bir adətim var. Hərdən suyun altı ilə də üzürəm.

Bunu deyib qurbağa suya baş vurdu. Əqrəb üzə bilməyib çayda boğuldu.

Şüurlu oxu

Mətndəki hadisələrin ardıcıllığını müəyyən et.

- Çayın ortasında əqrəb qurbağanı sancmaq istədi.
- Əqrəb suda boğuldu.
- Qurbağa suyun altı ilə üzməyə başladı.
- Əqrəb çayı keçmək üçün qurbağadan kömək istədi.
- Qurbağa əqrəbə kömək etdi.

# TORPAĞIN NAĞILI

Torpağın sinəsində həmişə qaratikan bitirdi. Torpaq isə bunu xoşlamırdı. O istəyirdi ki, hər tərəfdə zəmilər <u>ləpələnsin</u>, taxıllar bəhrə versin, insanları sevindirsin. Qaratikan isə onun yaxasından əl çəkmirdi. Kök atıb dərinlərə işləyirdi. Torpaq zar-zar ağlayırdı.



Bir gün külək torpağa kömək etmək istədi. O, bütün günü əsdi, lakin qaratikanı sındıra bilmədi.

Sonra yağış öz gücünü sınamaq istədi. Gecə də, gündüz də yağdı, sel kimi tökdü. Qaratikanı bolluca islatdı, ancaq onu yerindən çıxarıb ata bilmədi.

Torpaq yenə də ağladı. Bu dəfə günəş köməyə gəldi. O, sübh tezdən təndir kimi qızdı, ocaq kimi alovlandı. Qaratikanın yarpaqlarını bürüşdürdü, ancaq özünü yandıra bilmədi.

Ertəsi gün səhər torpaq qəribə səslər eşitdi. Qulaq asdı. İnsanlar idi. Onların dəmir atları vardı. İnsanlar bu dəmir atları sağa-sola çapdılar. Torpağın sinəsini sığallayıb hamarladılar. Qanqalları, qaratikanları kökündən çıxarıb atdılar.

*Xalidə Hasilova*

Düşün və cavab ver

1. Hekayənin əsas ideyası nədir?
   A) Torpaq qaratikan, qanqal kimi xeyirsiz bitkiləri sevmir.
   B) Günəş, külək, yağış torpağın dostlarıdır.
   C) İnsan hamıdan güclüdür.
2. Mətndə «dəmir at» deyəndə nə nəzərdə tutulur:
   A) tank  B) traktor  C) qatar

Söz ehtiyatı

3. «Ləpələnsin» sözünü hansı sözlə əvəz etmək olar?
   A) dalğalansın  B) ucalsın  C) parıldasın
4. «Ləpə» sözünün başqa hansı mənası var?

# ODUNÇUNUN SƏHVİ

Ⓐ Ağacın ətrafında başqa ağaclar bitmişdi. Hamısı da əyri, yaraşıqsız idi. Odunçuya elə gəldi ki, bunlar gözəl ağacı boy atmağa qoymur. Ona görə də ətrafdakı ağacları qırdı.

Ⓑ Bir gün odunçunun yolu yenə oradan düşdü. Kişi gözəl ağacın yerində çürümüş gövdə gördü. O, öz səhvini başa düşdü.

Ⓒ Odunçu meşədən keçirdi. Bir yaraşıqlı ağac gördü. Ağac cavan, dümdüz, gözəl idi. O, ayaq saxlayıb, ağaca xeyli baxdı.

Ç Gözəl ağac açıqlıqda, yaşıl talada tək qaldı. Günəş onu yandırdı, dolu döydü, külək əydi, qol-budağını sındırdı.



Düşün və cavab ver

**1** Mətnin hissələrinin düzgün ardıcıllığını müəyyən edin.

A) B, A, Ç, C
B) Ç, C, A, B
C) C, A, Ç, B

**2** Hekayənin əsas ideyası nədir?

A) Tək əldən səs çıxmaz.
B) Ağacları qırmaq olmaz.
C) Odunçuluq şərəfli peşədir.

## YAĞIŞ

Ana içəri girib dedi ki, çöldə bərk yağış yağır. Elə yağır ki, ucundan tut, göyə çıx. Fərid fikirləşdi: "Heç yağışdan tutub göyə çıxmaq olar? Birdən yağış kəssə, adam yarı yolda qalar!"

1 Hansı düzəltmə söz ad bildirən sözdən yaranıb?

A) yağış B) birdən C) fikirləşdi

2 Mətndə göy rəngdə verilmiş "bərk" sözünü hansı sözlə əvəz etmək olar?

A) qüvvətli B) güclü C) qalın

3 Bəs zəif yağışı necə adlandırmaq olar?

A) incə B) arıq C) narın

4 Adam adı bildirən mürəkkəb sözlərin ikinci sözündən yeni adlar düzəlt.

Günay – Aybəniz
Əliağa – ...
Cavanşir – ...
Elxan – ...

5 1-ci və 2-ci sütundakı sözləri uyğun olaraq birləşdirib əlamət bildirən mürəkkəb sözlər yarat. Sonra onları müvafiq heyvan adları ilə birlikdə işlət.

| 1 | 2 | 3 |
|---|---|---|
| Şələ | buynuz | dovşan |
| Yastı | quyruq | tülkü |
| Qoşa | göz | ayı |
| Çəp | daban | keçi |

6 Hansı düzəltmə söz qız adı ola bilməz?

A) gülüş B) gülünc C) gülər

7 Hansı düzəltmə söz oğlan adı ola bilməz?

A) coşqun B) daşqın C) çaşqın

BÖLMƏ 6

# SÖZ SƏNƏTİMİZ

- Yaxın mənalı sözlər
- Əks mənalı sözlər
- Sözün izahı



# TAPMACALAR

**Yadda saxla**

Tapmacalarda müəyyən fikir sual şəklində ifadə olunur. Bu sualın cavabını tapmaq üçün ilk növbədə tapmacadakı açar-sözlərə diqqət yetirmək lazımdır. Məsələn:

Yatanda yumru yatar,
Ətinə dərman qatar.
Hər kəs tutmaq istəsə,
Tikanı ələ batar.

Bu tapmacada *yumru, dərman, tikan* açar-sözlərdir. Yəqin, başa düşdünüz ki, tapmacanın cavabı “kirpi”dir.

● Tapmacaların hansı şəklə aid olduğunu tap. Cavabı taparkən hansı açar-sözlərdən istifadə etdiyini de.

**1**

Bir ağacım var,
bir gövdəsi,
beş budağı,
hər budaqda bir sədəf.

A

B

C


**2**

Qanadı var uçmağa,
İynəsi var sancmağa,
Sevir işi, zəhməti.
Odur ki, var hörməti.

A

B

C


## Musiqi alətləri

**3** Toyda-düyündə gəzər,
Səsi aləmi bəzər,
Qabırğası qatbaqat,
Gah yavaş, gah da bərk dart.

A

B

C


**4** Yumru təkər,
Əllərdə gəzər.

A

B

C


## Geyim əşyaları

**5** Bədəni var, başı yox,
Qolları var, ayağı yox.
Qarnını yırt, qanı yox.

A

B

C


**6** İki kürküm var,
On qardaşa çatar.
Bunu kim tapar?

A

B

C


# SANAMALAR

Yadda saxla

Uşaqlar gizlənqaç oyununa başlamazdan əvvəl şeir deyirlər ki, kimin gözlərini yumacağını təyin etsinlər. Belə şeirlər **sanama** adlanır.

**1** Aytəkin, Daşqın, Nurlan gizlənqaç oynamaq istəyirlər. Aytəkin Daşqından başlayaraq aşağıdakı sanamanı deyirsə, birinci kim yumacaq?

Baş barmaq,
Başala barmaq.
Uzun hacı
Qılturacı,
Xırdaca bacı.
Bu vurdu,
Bu tutdu,
Bu bişirdi,
Bu yedi,
Vay, bəbəyə qalmadı.




**2** Aşağıdakı şeirlərdən hansı sanamadır? Seçimini izah et.

Qatar gedir sola, sağa,
Çınqıl düşür bizim dağa,
Əmim oğlu, Sultan ağa,
Gəlin gedək oynamağa,
Oynamağın vaxtıdı,
Qızılgülün baxtıdı,
Ix, nıx, çıx.

Doğdu günəş qırmızı,
Can, gülüm, can, can!
Topladı oğlan, qızı,
Can, gülüm, can, can!
Hər birimiz bir çiçək,
Can, gülüm, can, can!
Bir bağçanın ulduzu,
Can, gülüm, can, can!
Qaçdı ayaz, qar-boran,
Can, gülüm, can, can!
Bizə qaldı çöl, *orman*,
Can, gülüm, can, can!

*Abdulla Şaiq*

Sözlük

***Orman*** – meşə

## QAYDALAR — YAXIN MƏNALI SÖZLƏR

Elə sözlər var ki, mənaca yaxın və ya tamamilə eynidir. Məsələn:

Ad bildirən sözlər: dalğa, ləpə
Əlamət bildirən sözlər: gənc, cavan
Say bildirən sözlər: çox, xeyli
Hərəkət bildirən sözlər: fikirləşmək, düşünmək

**1** Şeir parçasındakı yaxın mənalı sözləri tapın.

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən.
Anam, doğma vətənimsən,
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan.

*Səməd Vurğun*

**2** Hansı bənddə yaxın mənalı əlamət bildirən sözlər verilib?

A) ətir, qoxu, iy
B) dad, ləzzət, tam
C) arıq, cansız, çəlimsiz

**3** Hansı söz "çevik" sözü ilə yaxın mənalı deyil?

A) cəld  B) qıvraq  C) ağıllı  Ç) zirək

### Məntiq

**4** Söz sırasını tamamla

*fayda, xeyir, mənfəət, ...*

A) səmərə  B) kömək  C) ziyan

**5** Dördündən biri fərqlidir:

| | | | |
|---|---|---|---|
| A çovğun | B boran | C torpaq | Ç fırtına |
| A arzu | B hörmət | C dilək | Ç istək |
| A əmr | B hökm | C göstəriş | Ç xahiş |
| A təmiz | B balaca | C xırda | Ç kiçik |

# XAQANİ

**I hissə**

Bir gün Şirvan *xaqanı* Məlhəm kəndinin yanından keçirmiş. Kənd əhlindən heç kim onun *pişvazına çıxmamışdı*. Bu, hökmdarı çox təəccübləndirir. Çöldə çırpı yığan bir uşağı yanına çağırıb deyir:

– Oğlum, sizin kəndin böyüyü kimdir?

– Əmi, bizim kənddə ən böyük camışdır.

– A bala, onu soruşmuram. Bilmək istəyirəm ki, sizin kənddə qonaq qabağına kim çıxır?

– Əmi, bizim kənddə qonağı hamıdan qabaq itlər qarşılayır!

– Yox, canım, soruşuram, yəni ağsaqqal adam kimdir?

– Əmi, adam istəsən, mən, saqqal istəsən, bilmirəm.



Sözlük

***Xaqan*** – qədim türk xalqlarında hökmdar

***Pişvazına çıxmaq*** – hörmətlə qarşılamaq

Düşün və cavab ver

1. Səncə, uşağın bu cavablarından sonra xaqan onunla necə rəftar edəcək?

**II hissə**

Uşağın cavabları xaqanın xoşuna gəlir, bir qızıl çıxarıb deyir:

– Al, oğlum! Bu qızılı sənə bağışlayıram.

– Sağ ol, əmi, istəmirəm!

– Niyə?

– Anam soruşar, bu qızılı haradan tapmısan? Şübhələnər, mənə acıqlanar.

– Oğlum, mən Şirvanın xaqanıyam. Anana söylə ki, qızılı mənə xaqan verdi.

Uşaq təzim edib deyir:

– Şahım, elə isə heç almaram, axı padşah adama bir qızıl verməz. Anam deyər ki, padşah sənə çox qızıl vermiş olar, bəs qalanını neyləmisən?

Kiçik bir uşaqda bu ____________ görən xaqan onu oxutmaq qərarına gəlir. Uşağın atasından razılıq alıb onu saraya aparır. Onun bütün xərclərini öz boynuna götürüb böyük alimlərin tərbiyəsinə verir.

Zaman keçir. Həmin uşaq böyük şair olur, Xaqani Şirvani adı ilə bütün dünyada şöhrət qazanır.



Söz ehtiyatı

**2** "Təzim edib" sözünü hansı sözlə əvəz etmək olar?

A) acıqlanıb B) uzaqlaşıb C) baş əyib

Şüurlu oxu

**3** Mavi rəngli boşluğun yerinə hansı söz uyğun gəlir?

A) hazırcavablığı B) utancaqlığı C) alicənablığı

# OYUNLAR

Yadda saxla

Azərbaycanda qədimdən bəri uşaqların sevdiyi bir çox maraqlı oyunlar olub: kosaldıqaç, dirədöymə, beşdaş, çilingağac və başqaları. Belə oyunlardan biri də bənövşə adlanır.

## BƏNÖVŞƏ

Uşaqlar iki dəstəyə ayrılırlar. Hər dəstədə onların sayı eyni olmalıdır. Dəstələr özünə başçı seçir və bir-birindən on-on beş addım aralı əl-ələ tutub dayanırlar.

Başçılardan biri o birisinə deyir:

– Bənövşə!

O birisi cavab verir:

– Bəndə düşə!

Əvvəlki başçı deyir:

– Bizdən sizə kim düşə?



O biri başçı uşaqlardan birinin adını çəkir. Məsələn:

– Günay düşə!

Günay cərgədən ayrılıb yüyürə-yüyürə əl-ələ tutmuş uşaqların *səfini* yarmalıdır. Əgər o, cərgəni yarıb keçə bilsə, həmin dəstədən bir uşaq da götürüb yenə əvvəlki yerinə qayıdır. Yox, keçə bilməsə, orada qalıb, rəqib dəstəyə qoşulmalıdır.

Axırda hansı dəstədə çox uşaq qalsa, o komanda qalib gəlir.

Sözlük

***Səf*** – cərgə, sıra

Dil qaydaları

"Bənövşə" sözü hansı halda böyük hərflə yazılır?

A) gül adı bildirəndə
B) oyun adı bildirəndə
C) adam adı bildirəndə

QAYDALAR

## ƏKS MƏNALI SÖZLƏR

Əks mənalı sözlər ad, əlamət, say və ya hərəkət bildirən sözlər ola bilər. Məsələn:

Ad bildirən sözlər: alıcı – satıcı
Əlamət bildirən sözlər: asan – çətin
Say bildirən sözlər: az – çox
Hərəkət bildirən sözlər: itirmək – tapmaq

1 Hansı söz "eyni" sözü ilə əks mənalıdır?
A) bərabər B) müxtəlif C) həmişə

2 Hansı sırada əks mənalı mürəkkəb sözlər verilib?
A) ayaqyalın – başıaçıq
B) xəstələnmək – sağalmaq
C) gülərüz – qaraqabaq

3 Hansı sırada əks mənalı əlamət bildirən sözlər verilib?
A) küs – barış
B) kədər – sevinc
C) dayaz – dərin

4 Hansı söz "yalan" sözü ilə əks mənalı ***deyil***?
A) doğru B) böhtan C) həqiqət Ç) gerçək

5 Hansı bəndi "doğru-yanlış" söz cütü ilə əvəz etmək olar?
A) axmaq – ağıllı
B) dürüst – səhv
C) ağır – yüngül

6 "Düz – kələ-kötür" əks mənalı sözlər cütündəki "düz" hansı sözlə yaxın mənalıdır?
A) doğru
B) hamar
C) həqiqi

7 "Müvəqqəti" sözü hansı sözlərlə əks mənalıdır?
A) daimi, əbədi
B) arabir, həmişə
C) faydalı, xeyirli

# ATALAR SÖZLƏRİ

Yadda saxla

Ata-babalarımız öz həyat təcrübəsini atalar sözləri vasitəsilə gələcək nəsillərə ötürüb. Atalar sözü *müdrik* fikir ifadə edir.

Sözlük

***Müdrik*** – ağıllı, dərin mənalı

Düşün və cavab ver

1. Söhbət zamanı biri ağ yalan danışanda bu ifadələrdən hansı işlədilir?
   A) Sonrakı peşmançılıq fayda verməz.
   B) Bişmiş toyuğun gülməyi gəlir.
   C) Saqqalım yoxdur, sözüm ötmür.

2. «*Yol böyüyündür, su kiçiyin!*» atalar sözünün mənasını izah et. Səncə, niyə su gətirəndə ilk növbədə kiçiyə təklif edirlər, kiçiklər isə hər zaman böyüklərə yol verməlidirlər?

3. «*Yalan ayaq tutar, amma yeriməz*» atalar sözünü misallarla izah et. Aşağıdakı atalar sözlərindən hansı bu atalar sözü ilə eyni mənalıdır?
   A) Yalan olmasa, doğru yeriməz.
   B) Yalan cücərər, amma bitməz.
   C) Yalan danışan yanındakını qanmaz yerinə qoyar.

4. Əvvəli 1-ci sütunda verilmiş atalar sözlərinin davamını 2-ci sütunda tap.

| I | II |
|---|---|
| Yorğanına bax, | gör fələk nə sayır. |
| Şərti şumda kəs, | tüstü çıxmaz. |
| Sən saydığını say, | yağmura düşdük. |
| Quyuya tüpürmə, | ayağını uzat. |
| Od yanmasa, | xırmanda yabalaşmayasan! |
| Yağışdan çıxdıq, | suyunu içməli olarsan. |

**5** Hansı atalar sözlərində qırmızı hərflərlə verilmiş sözlərin yeri səhv düşüb?

1) Dostsuz quş qanadsız insan kimidir.
2) Acı söz doğru olar.
3) Bağa bax, üzüm olsun, yeməyə üzün olsun.
4) İstəyirsən bel-kürək, al əlinə bal-çörək.
5) Yayda işlə, qışda dişlə.

**6** Hansı ifadə atalar sözlərini tamamlaya bilər?

1. Qonağa ... deməzlər
   A) «Çörək yeyirsən»
   B) «Xoş gəlmisən»
   C) «Həmişə sən gələsən»

2. Qonaq ... deməz.
   A) «Süfrəniz bol olsun»
   B) «Allah artıq eləsin»
   C) «Doymadım»

3. Yalançının ... olmaz
   A) pulu
   B) biliyi
   C) yaddaşı

4. Gözəllik ondur, ... dondur
   A) biri B) doqquzu C) onu da

5. Qurunun oduna ... da yanar.
   A) baş B) daş C) yaş

**7** Aşağıdakı atalar sözlərində əks mənalı sözlərin yeri səhv düşüb. Onları düzgün işlətməklə atalar sözlərini oxu.

1. Kiçik olan yerdə böyük danışmaz.
2. Vətən cənnət olsa da, yenə qürbət yaxşıdır.
3. Aqil ilə bal yemə, cahil ilə daş daşı.

# LAYLALAR

Yadda saxla

Ana körpəsini yatıranda ona şeir oxuyur. Bu şeirlə balasını əzizləyir, ona öz arzu və diləklərini bildirir. Belə şeirlərə **layla** deyilir.



1 Cədvəlin hansı sütununda laylalar verilib?

| I | II |
|---|---|
| Gəlirdim kənddən,<br>Səs gəldi bənddən,<br>Ağzı sümükdən,<br>Saqqalı ətdən. | Evində, eşiyində,<br>Yat, quzum, beşiyində.<br>Dan ulduzu, bir də mən<br>Durmuşuq keşiyində. |
| Gün düşdü qar üstünə,<br>Bağçada bar üstünə.<br>Tənbəl yatan öküzün<br>Quşlar qonar üstünə. | Laylay dedim ucadan,<br>Səsim çıxdı bacadan.<br>Tanrı səni saxlasın<br>Çiçəkdən, qızılcadan. |

Şüurlu oxu

2 Hansı şeirdə ana körpəsinin tez dil açmasını istəyir?

A) Sudan sel iyi gəlir,
Daşdan gil iyi gəlir.
A mənim bircə balam,
Səndən gül iyi gəlir.

B) Nar budağın əyəndə,
Ucu yerə dəyəndə,
Bir qoç qurban kəsəcəm
Balam «ana» deyəndə.

C) Laylay dedim, yat, bala,
Yuxuna şəkər qat, bala.
Ümidim bircə sənsən,
Boya-başa çat, bala.

## Yaradıcılıq

**3** Verilmiş sözləri şeirdə uyğun gələn misraların sonunda işlət.

*bağlama, ağlama, dağlama*

Laylay dedim, ...
Ürəyimi ...
Böyü, bir qoç igid ol,
Mənə ümid ... .

**4** Misraların düzgün ardıcıllığını tap və laylanı düzgün oxu.

Ömrüm, günüm uzansın
İyləmədim doyunca
Bu balamın toyunca
Bir gül əkdim boyunca

**5** Məşhur laylalardan biri belə başlayır:

Laylay dedim yatasan,
Qızılgülə batasan...

Bir ana bu laylanı belə tamamladı:

Qızılgülün ətrindən
Öz yuxuna qatasan.

Başqa birisi isə belə söylədi:

Qızılgülün içində
Şirin yuxu tapasan.

Bəs sən bu laylanı necə bitirərdin?

**6** Oxuduğun laylaların hansı misraları qafiyələnir?

## Dil qaydaları

**7** Laylanın hansı misrasında «gülüm» sözü hərəkət bildirir?

A laylay, gülüm, laylay,
Gülüm, sünbülüm, laylay.
Böyü, sənin sayəndə
Mən də bir gülüm, laylay.

# TÜLKÜ VƏ DƏVƏ

Günlərin bir günü yoldan keçən dəvə tülkü ilə rastlaşdı. Tülkü ona sataşmağa başladı:

– Dəvə, görərsən, mən bir gün səni yeyəcəyəm.

Dəvə güldü, bir söz deməyib işinin dalınca getdi. Ancaq öz-özünə dedi: «Sən tülkü ol, mən də dəvə. Sənə elə sataşım ki, ömrün boyu yadından çıxmasın».

Bir gün sonra dəvə tülkünün yuvasının yanına gəldi, uzanıb özünü ölülüyə vurdu.

Tülkü yuvasından bayıra çıxıb gördü ki, dəvə yıxılıb ölüb, özü də düz yuvasının ağzında. Dəvəni qıçından dişlədi ki, görsün doğrudan ölüb, ya yox. Dəvə tərpənmədi. Tülkü öz-özünə dedi: «Bunu burada qoysam, çaqqal, canavar gəlib yeyər, yaxşısı budur, quyruğunu quyruğuma bağlayıb aparım öz yuvama».

O, dəvənin quyruğunu öz quyruğuna bağladı. Düyünün möhkəm olduğunu yoxlamaq üçün bir neçə dəfə dartındı.

Dəvə işin bitdiyini görüb birdən yerindən qalxdı və yola düzəldi. Dəvənin quyruğundan asılmış tülkü isə havada yırğalanmağa başladı.



Bir az gedəndən sonra canavara rast gəldilər. Canavar tülkünü bu halda görüb güldü:

– Tülkü lələ, xeyir ola, belə hara gedirsən?

Tülkü dedi:

– Hələ özümə də bəlli deyil. Böyüklərlə quyruq-quyruğa vermişəm, görək hara aparacaq.

*Səməd Behrəngi*

Yadda saxla

**Təmsil nağıla bənzəyir. Lakin təmsil qəhrəmanları həmişə heyvanlar və quşlar olur. Təmsil həm şeirlə, həm də nağıl şəklində yazıla bilər. Təmsil müdrik fikir ifadə edir.**

Düşün və cavab ver

1. Dərsliyin "Heyvanlar" bölməsində dəvələr haqqında oxumusan. "Tülkü və dəvə" təmsilində dəvəyə xas olan hansı keyfiyyətdən danışılır?

A) Dəvə uzun müddət ac-susuz qala bilir.
B) Dəvə kinli olur.
C) Dəvə ev heyvanıdır.

Yadda saxla

Hər bir müəllif əsər yazarkən müəyyən bir fikri oxuculara çatdırmaq istəyir. Məsələn, demək istəyir ki, *vətəni sevmək lazımdır* və ya *insanlar bir-birinə qarşı qayğıkeş olmalıdırlar* və s. Əsərdə ifadə olunan əsas fikir əsərin **ideyası** adlanır. Əsəri oxuyarkən onun ideyasını duymağa çalışın.

2. "Tülkü və dəvə" təmsilinin ideyasına hansı atalar sözü uyğun gəlir?

A) Keçinin əcəli çatanda buynuzunu çobanın çomağına sürtər.
B) Dəvədən böyük fil var.
C) Dəvənin qanadı olsa, uçulmamış dam qalmaz.

## ELAN

Məktəbimizdə yazıçılarla görüş keçirilməli idi. Görüşü təşkil etmək bizim sinfə həvalə olunmuşdu. Müəllimimiz hərəyə bir iş tapşırdı. Kimi görüşdə şeir deməli, kimi aparıcılıq etməli idi. Mən də bu tədbir haqqında elan yazmalı idim.

Evə çatan kimi işə başladım. Kompyuterdə gözəl *şriftlər* tapdım və bər-bəzəkli bir elan yazdım:



*Üç günnən sonra məktəbimizdə yazıçılarnan görüş olacaq.*

HAMI GƏLSİN!

Sinifdə elanı oxuyanda Orxan dedi:

– Bu lap tapmacadır ki! İndi baş sındır görüm "üç günnən sonra" nə deməkdir. Bəlkə, kimsə bu elanı sabah oxuyacaq.

Başqa uşaqlar da yerbəyerdən səsləndilər:

– "Gündən" sözü düzgün yazılmayıb.

– Şriftlər yaxşı oxunmur.

– "Yazıçılarla" sözündə də səhv var.

Axırda müəllim dedi:

- Yaxşı, gəlin elanın mətnini yenidən hazırlayaq.

Bir azdan yeni elanımız hazır idi:

**Noyabrın 23-də saat 12-də**
**məktəbin akt zalında**
**YAZIÇILARLA GÖRÜŞ**
**olacaq.**
Hamı dəvət olunur.
*Təşkilatçı - $2^b$ sinfi*

### Sözlük

***Şrift*** – müxtəlif formalı çap hərfləri

### Düşün və cavab ver

2-ci elanda mətnin hansı hissəsi daha cəlbedici şriftlə verilib?

A) Tədbirin vaxtı

B) Tədbirin adı

C) Tədbirin keçirildiyi yer

# ƏRƏBİN DƏVƏLƏRİ

Bir ərəb dəvələrini başqa şəhərə satmağa aparırdı. Onun cəmi on dəvəsi var idi. Birini özü minib qalanlarını iplə bir-birinə bağlamışdı. Ərəb yol boyu gözdə-qulaqda idi ki, dəvələrini itirməsin. Bir az getdikdən sonra o, dəvələrini sayıb gördü ki, onların sayı doqquzdur. Öz-özünə dedi:

– Deyəsən, dəvənin birini itirmişəm.

O, yerə enib dəvələri sıraya düzdü və onları bir-bir saydı. Dəvələrin sayı 10 oldu. Ərəbin ürəyi yerinə gəldi.

– Şükür Allaha! Hamısı yerindədir.



O, dəvəyə minib yoluna davam etdi. Xeyli getdikdən sonra dəvələrini yenidən saydı. Yenə 9 oldu. Ərəb mindiyi dəvədən düşdü, onları bir də saydı. Deyəsən, itən dəvə tapılmışdı, 10-u da yerində idi. Ərəb cin atına mindi:

– Bu nə bəladır mən düşdüm?! Hər dəfə dəvəyə minəndə dəvələrdən biri yoxa çıxır. Gərək piyada gedim, yoxsa elə itər ki, tapa bilmərəm.

Bunu deyib ərəb səfərin sonuna kimi daha dəvəyə minmədi.

Düşün və cavab ver

**1** Nəyə görə dəvələrin sayı gah 9, gah da 10 olurdu?

Söz ehtiyatı

**2** Yaxın mənalı ifadələri müəyyən et.

| | |
|---|---|
| 1) gözdə-qulaqda olmaq | A) hirslənmək |
| 2) ürəyi yerinə gəlmək | B) diqqətli olmaq |
| 3) cin atına minmək | C) sakitləşmək |

# YANILTMACLAR

Yadda saxla

**Yanıltmac** bir və ya bir neçə cümlədən ibarət olur. Yanıltmacdakı oxşar səslər və sözlər onların deyilişini çətinləşdirir və dil dolaşır. "Yanıltmac" sözü də buradan götürülüb.

Sözlük

***Yanılmaq*** – səhv etmək, xətaya yol vermək

1. Aşağıdakı cümləni ucadan yavaş-yavaş oxu:
"Aşpaz Abbas aş asmış, asmışsa da, az asmış".
İndi isə onu tez-tez deməyə çalış.
Səncə, nəyə görə bu cümləni demək çətindir?

2. Aşağıdakı yanıltmacda ən çox hansı səslər təkrar olunur?
Dəmirçi Dadaş dayı, dədəm deyir, damın dalında dəmiri dəmirə döyməsin. Dəmiri dəmirə döyərsən, dəmir deşilər.

3. Aşağıdakı yanıltmacda hansı sözlər oxşar səslənir və yanıltmacı söyləməkdə çətinlik yaradır?
Dəyirmana girdi köpək. Dəyirmançı vurdu kötək. Bilmirəm, kəpək yedi köpdü köpək, yoxsa kötək yedi köpdü köpək?!

4. Bu yanıltmaclardan hansını söyləmək daha çətindir?
A) Qığılcımı qıcıqlandırma, qıcıqlandıracaqsansa, qığılcımlanacaq.
B) Ocağı qığılcımlandırma, sən qığılcımlandırsan da, qığılcımlanacaq, qığılcımlandırmasan da, qığılcımlanacaq.

5. Aşağıdakı yanıltmacı əzbərlə və birnəfəsə deməyə çalış.
Getdim gördüm bir dərədə iki kar, kor, kürküyırtıq kirpi var. Dişi kar, kor, kürküyırtıq kirpi erkək kar, kor, kürküyırtıq kirpinin kürkünü yamamaqdansa, erkək kar, kor, kürküyırtıq kirpi dişi kar, kor, kürküyırtıq kirpinin kürkünü yamayır.

QAYDALAR **SÖZÜN İZAHI**

Bir çox sözləri yaxın və ya əks mənalı sözün köməyi ilə izah etmək olar. Məsələn:

**güclü** – qüvvətli (yaxın mənalı sözün köməyi ilə)
**güclü** – zəif olmayan (əks mənalı sözün köməyi ilə)

**1** *Doğru, yağı, kədərli, məğrur* sözlərini yaxın və əks mənalı sözlərin köməyi ilə izah et.

Bəzi sözlərin nə yaxın mənalı, nə də əks mənalı qarşılığı olur. Belə sözləri izah etmək üçün ilk növbədə həmin sözün aid olduğu məna qrupunu müəyyən etmək lazımdır. Məsələn, "alma" sözü məna qrupuna görə meyvədir. Onun əlamətləri belədir:

Rəngi – sarı, qırmızı və ya yaşıl
Dadı – şirin və ya turş
Forması – girdə və ya uzunsov

Deməli, "alma" sözünü belə izah etmək olar:

***Alma*** – sarı, qırmızı və ya yaşıl rəngli, girdə və ya uzunsov formalı, şirin və ya turş meyvə.

**2** Aşağıda hansı sözün izahı verilmişdir?

*Bədəni sümük qınla örtülü, qısa ayaqları ilə çox yavaş hərəkət edən, ayaqlarını və başını qınının içində gizlədən sürünən heyvan*

A) ilan B) kirpi C) tısbağa Ç) dovşan

**3** Dördündən biri fərqlidir:

| | A | B | C | Ç |
|---|---|---|---|---|
| 1 | bənna | mühəndis | uşaq | müəllim |
| 2 | canavar | inək | şir | tülkü |
| 3 | qurbağa | siçan | klaviatura | monitor |
| 4 | avtobus | metro | qatar | pencək |

# GÖYƏRÇİN

## I hissə

Qədim zamanlarda xeyirxah bir padşah yaşayırdı. O, öz ölkəsini əmin-amanlıqla idarə eləyirdi.

Günlərin bir günü qonşu ölkənin hökmdarı onun ölkəsinə hücum edib padşahı təkbətək döyüşə çağırdı.

Padşah çoxdan idi ki, müharibə etmirdi. Odur ki, dava paltarını sarayın çardağında, əl-ayaqdan uzaq yerdə saxlayırdı. Savaşa bir gün qalmış şah anasından xahiş elədi ki, onun qılıncı ilə dəbilqəsini gətirsin.

Anası getdi. Çox çəkmədi ki, oğlunun qılıncını, qalxanını gətirdi. Padşah anasından soruşdu:

- Bəs papağım hanı?

Ana dedi:

- Səni and verirəm halal südümə, papağa dəymə!

- Anacan, mən padşaham! Padşah isə döyüş meydanına dəbilqəsiz çıxa bilməz.

Anası çardaqda gördüklərini deməli oldu:

- Bala, sənin döyüş papağının içində bir ağ göyərçin yuva qurub. Özünün də üç balası var. Mən bu günahsız balalara toxunsam, ağ göyərçin bizdən küsüb gedər. Yetim balaların ah-naləsi ölkəmizə bəlalar gətirər. Gəl bu dəfə döyüşə dəbilqəsiz get.



**II hissə**



Bu sözləri eşidən padşah heç nə demədi, düşmənlə əlbəyaxa döyüşə başıaçıq çıxdı. Qonşu ölkənin hökmdarı rəqibinin papaqsız olduğunu görüb, bunun səbəbini soruşdu. Padşah dedi:

- Mənim dəbilqəmdə göyərçin üç bala çıxarıb. Anam südünə and verdi ki, balalara toxunmayım.

Bunu eşidən düşmən hökmdar qılıncını qınına qoydu, əlini düşməninə uzadıb dedi:

- Gəl barışaq! Sənin anan bir quşun - ağ göyərçinin evini dağıtmaq istəmədi. Biz niyə nahaq qan töküb minlərlə insanın evini dağıdaq?

Onlar barışdılar. O gündən ağ göyərçin ______ quşu hesab olunur.

Şüurlu oxu

**1** Mətnin sonuncu cümləsində mavi rəngli boşluğun yerinə hansı söz uyğun gəlir?

A) müharibə B) döyüş C) sülh

Söz ehtiyatı

**2** Hansı şəkildə dəbilqə təsvir olunub?

A)  B)  C) 

"Dəbilqə", "qılınc" və "qalxan" sözlərini izah et.

Dil qaydaları

**3** Mətnin 1-ci cümləsində əlamət bildirən neçə söz var?

**4** Aşağıdakı sözləri əlifba sırası ilə de:

*sülh, müharibə, hökmdar, padşah, göyərçin*

# BAYATILAR

**Yadda saxla**

Bayatı 4 misradan ibarət şeirdir. 1-ci, 2-ci və 4-cü misraları qafiyələnir. Bayatılar çox vaxt "əzizinəm" və ya "mən aşiq" sözləri ilə başlanır.

**Şüurlu oxu**

Əzizinəm, din barı,
Danış barı, din barı.
İgidə tab gətirməz
Yağı tikən min barı.

1. Bayatıda ifadə olunan əsas fikir nədən ibarətdir?
A) İnsan gərək həmişə danışıb-gülsün.
B) Düşmən gələndə barının üstünə çıxmaq lazımdır.
C) İgidlərimiz düşmənin müqavimətini qıracaqlar.

2. Bayatıdakı "barı" sözü hansı misrada "hasar", hansılarda "heç olmazsa" mənasında işlənib?

**Dil qaydaları**

3. Sonuncu misradakı "yağı" sözü hansı sözlə eyni mənalıdır?
A) dost B) düşmən C) mərd

4. İkinci misradakı "din" sözü bayatıdakı hansı sözlə eyni mənalıdır?
A) tab gətirmək B) tikmək C) danışmaq

5. Sonuncu misradakı "min" sözü:
A) say bildirən sözdür;
B) hərəkət bildirən sözdür;
C) ad bildirən sözdür.

6. Hansı sözün mənalarından biri hərəkət, digəri ad bildirir?
A) min B) din C) barı

# JANR NƏDİR?

**Yaddā saxla**

Hər bir əsər müəyyən xüsusiyyətlərə malik olur. Məsələn, atalar sözləri müdrik fikir, tapmacalar sual ifadə edir, bayatılar dörd misradan ibarət olur, yanıltmacı demək çətindir. Bu cür xüsusiyyətlərə görə əsərlər janrlara ayrılır.

1. Aşağıdakı xüsusiyyətlərin hansı janra aid olduğunu müəyyən et.

   -- *şeirlə və ya nəsrlə yazıla bilər;*
   -- *nağıla bənzəyir;*
   -- *baş qəhrəmanları heyvanlar və quşlar olur;*
   -- *məzmunu müdrik fikir ifadə edir.*

   A) atalar sözü
   B) təmsil
   C) layla

2. Atalar sözünün əsas xüsusiyyəti nədir?

   A) Dörd misradan ibarət olur.
   B) Uşağı yatızdırmaq üçün söylənilir.
   C) Müdrik fikir ifadə edir.

3. Hansı xüsusiyyət tapmaca janrına aid deyil?

   A) Sual ifadə edir.
   B) Yalnız nəsrlə yazılır.
   C) Həcmcə kiçik olur.

4. Şeirin janrını müəyyən et.

   *Mən aşiqəm gələnə,*
   *Dərdin sənlə bölənə.*
   *Namərdə bel bağlama,*
   *Kölgəndə kölgələnə.*

   A) bayatı B) tapmaca C) layla

   Seçimini izah et.

1. Hansı atalar sözündə təvazökarlıq tövsiyə olunur?
   A) Yıxılana balta çalmazlar.
   B) Zər qədrini zərgər bilər.
   C) Ağac bar verəndə başını aşağı dikər.

2. *Əyri – düz, dar – geniş, doğru – ...*
   Nöqtələrin yerinə hansı söz uyğun gəlir?
   A) düzgün
   B) yanlış
   C) həqiqi

3. Hansı atalar sözündə əks mənalı sözlərin yeri dəyişik düşüb?
   A) Kiçiyin kiçik yeri var, böyüyün – böyük.
   B) Hər şeyin təzəsi, dostun köhnəsi.
   C) Az bilsən də, çox danış.

4. Hansı sırada yanıltmac verilib?
   A) Kolları gəzər pusa-pusa, qıçları uzun, qolu qısa.
   B) Qonşu qonşuya baxar, özünü oda yaxar.
   C) Çəp keçi çəp keçidi çəpəki keçib gedər, çəp keçi çəp keçidi çəpəki keçib çəpəri keçər.

5. Hansı sırada əks mənalı ad bildirən sözlər verilib?
   A) daxma – koma
   B) sual – cavab
   C) aparmaq – gətirmək

6. Yaxın mənalı sözləri tap.
   A) bulaq – çeşmə
   B) dağ – dərə
   C) ayaq – yerimək

7. "Aş" sözünün belə bir mənası yoxdur?
   A) maneəni keç
   B) ağaca dırmaş
   C) plov

BÖLMƏ 7

# NAĞILLAR ALƏMİNDƏ

- Söz birləşməsi
- Cümlə
- Cümlənin növləri
- Nitq etiketləri



# BALACA ƏHMƏD



## I hissə

Biri vardı, biri yoxdu, uca dağın döşündə Ağbulaq deyilən gözəl bir kənd var idi. Bu kəndin cavanları at çapmaqda, ox atmaqda ad qazanmışdılar. Onların qorxusundan bir düşmən kəndə yaxın düşə bilmirdi.

Bir gün qonşu ölkənin padşahı qoşun toplayıb bu yerlərə hücum çəkdi. Bütün kəndləri çapıb taladı, axırda gəlib yetişdi Ağbulaq kəndinə. Padşah bu kəndin döyüşkən kişiləri haqqında eşitmişdi. Bilirdi ki, onlarla döyüşə başlasa, çoxlu əsgər itirə bilər. Odur ki, Ağbulağı hiylə ilə tutmaq qərarına gəldi. O, öz sərkərdələrindən bir neçə nəfəri kəndə elçi göndərdi.

Elçilər ağ bayraq qaldırıb Ağbulağa girdilər. Kənd ağsaqqallarını toplayıb dedilər:

- Qoşunumuz sizin kəndi üzük qaşı kimi dövrəyə alıb. Bir himə bənddir ki, kəndin altını üstünə çevirsin. Amma padşahımız rəhmlidir, qan tökmək istəmir. Sizə belə bir təklifimiz var. Sabah kəndinizin ağıllı adamlarını meydana yığın. Onlara üç sual verəcəyik. Əgər suallara düzgün cavab versələr, sizinlə işimiz yoxdur. Yox, cavab verə bilməsələr, gərək silahı yerə qoyub təslim olasınız. İndi nə deyirsiniz, şərtə razısınızmı?



Kəndin cavanları qəzəbdən bığlarını gəmirirdilər. Onlar döyüşməyə can atırdılar. Amma bu kənddə böyüyə hörmət var idi. Heç kim ağsaqqalın bir sözünü iki eləməzdi.

Ağsaqqallar gördülər ki, bu boyda qoşunun qabağında tab gətirmək olmaz. Odur ki, razılıq verdilər.

Ağbulaqda Əhməd adında bir oğlan yaşayırdı. Balaca olsa da, ağılda, fərasətdə ona çatan yox idi. Əhməd düşmən padşahın şərtini eşidəndə qərara gəldi ki, sabah meydana getsin, görsün nə suallardır.

Şüurlu oxu

1 Mətndə mavi rənglə verilmiş "*o*" sözünü hansı sözlə əvəz etmək olar?

A) camaat B) Ağbulaq C) padşah

2 Padşah Ağbulaq kəndi ilə döyüşə girmək istəmirdi, çünki

A) rəhmli idi;

B) kəndin dəliqanlılarından qorxurdu.

3 Kəndin ağsaqqalları padşahın şərtinə razı oldular, çünki...

A) camaatı qırğına vermək istəmirdilər;

B) arxayın idilər ki, sualların cavabını tapa biləcəklər.

Düşün və cavab ver

4 Nə üçün elçilər kəndə girəndə ağ bayraq qaldırdılar?

## II hissə

Bəli, ertəsi gün hamı meydana yığışdı. Padşahın adamları bir boyda, bir biçimdə, bir rəngdə iki *madyan* gətirmişdilər. Elçilərdən biri kənd ağsaqqallarına dedi:

– Tapın görək bunlardan hansı anadır, hansı bala? Amma atların dişinə baxmaq olmaz.

Qocalar qaldılar mətəl, çünki atlar bir-birinə o qədər oxşayırdı ki, seçmək olmurdu. Bu vaxt Əhməd camaatın içindən çıxıb ağsaqqallara yaxınlaşdı ki, qoyun bu sualın cavabını mən verim. Ağsaqqallar izn verdilər.

Əhməd tez meydanın bir küncündə iki *axur* düzəltdi. Hərəsinə bir az arpa tökdü. Axurlar hazır olanda Əhməd atların ipini açıb buraxdı. Atlardan biri kişnəyib axura tərəf qaçdı, başladı arpa yeməyə. O biri qaçıb onun böyrünə qısıldı.

Əhməd dedi:

– Kişnəyən at anadır, onun yanına qaçan da bala.

Bundan sonra padşahın adamları zəmbildən üç alma çıxarıb dedilər:

– Bu almalardan biri bu il dərilib, biri keçən il, üçüncüsü inişil. İndi siz gərək hər almanın neçə illik olduğunu tapasınız. Ancaq almaları kəsmək, ya dişləmək olmaz.



Əhməd yenə qabağa çıxıb bir qab su istədi. Almaların üçünü də suya saldı. Bir alma çökdü suyun dibinə, ikincisi qaldı suyun ortasında, üçüncüsü də suyun üzünə çıxdı. Əhməd dedi:

– Suyun dibindəki builki almadır, canı şirəli olduğu üçün ağırdır. İkinci alma keçənilkidir, bir az şirəsi çəkilib deyə suyun ortasında qalıb. Üçüncü alma isə inişilin meyvəsidir, şirəsi tamam çəkilib, ona görə də suyun üzünə çıxıb.

Axırda padşahın adamları bir böyük daş gətirdilər ki, bundan bizim padşahımıza bir dəst paltar tikməlisən. Onlar arxayın idilər ki, Əhməd bu dəfə sualın cavabını tapa bilməyəcək, kənd təslim olacaq.

Əhməd işi belə görüb dedi:

– Daşdan paltar tikmək mənim əlimdə heç nədir. Ancaq iynəm qırılıb, sapım da qurtarıb.

Sonra o, yerdən bir ovuc qum götürüb şahın adamlarına verdi:

– Alın, bu qumdan mənim üçün iynə-sap düzəldin.

Düşmənnərin böyüyü dedi:

– Qumdan da iynə-sap olar?

– Çox yaxşı olar. Qumdan iynə-sap düzəltməyi bacarmayan adam daşdan paltar geyə bilməz. Nə vaxt iynəmi, sapımı gətirsəniz, paltarınızı tikib verərəm.

Padşahın adamları pərt olub geri qayıtdılar. Bir də o kəndin həndəvərinə hərlənmədilər. Beləcə, ağıllı Əhməd doğma kəndini yadellilərdən xilas etdi.

## Sözlük

***Madyan*** – dişi at
***Axur*** – heyvanlara yem vermək üçün xüsusi düzəldilmiş yer

## Düşün və cavab ver

**5** Səncə, qolu güclü adam öz xalqına daha çox xeyir verə bilər, yoxsa ağıllı adam?

## Söz ehtiyatı

**6** Aşağıdakı sözlərin mənalarını lüğətin köməyi ilə araşdır:

madyan buğa xoruz təkə qoç

**Məntiq.** Bu sözlərdən hansı digərlərindən fərqlidir? (Nəzərə al ki, bu sualın iki düzgün cavabı var).

## Dil qaydaları

**7** Mətndə qırmızı hərflərlə verilmiş sözlərin düzgün yazılışı hansı sırada verilib?

A) məttəl, zənbildən, düşmənərin
B) məəttəl, zənbildən, düşmənlərin
C) məətəl, zənbildən, düşmənnərin

QAYDALAR

## SÖZ BİRLƏŞMƏSİ

Səslər birləşib söz yaradır. Səsdən fərqli olaraq, sözün mənası olur. Sözlər bir-biri ilə birləşdikdə söz birləşməsi yaranır. Söz birləşməsinin də mənası olur. Lakin sözlə müqayisədə söz birləşməsinin mənası daha dəqiq olur. Müqayisə edin:

şagird – söz

ikinci sinif şagirdi – söz birləşməsi

**1** Hansı bənddə söz birləşməsi verilib?

A) quş dimdik
B) quşun dimdiyi
C) Quşun dimdiyi var.

**2** A və B sütunlarındakı sözləri düzgün birləşdirməklə söz birləşmələri yaradın.

| A | B |
|---|---|
| ayı | tülkü |
| otaq | çəmən |
| yaşıl | səs |
| hiyləgər | pəncə |
| məktəb | bina |
| sait | qapı |

Nümunə:
*otağın qapısı*

Söz birləşməsi də söz kimi ad, əlamət, say və ya hərəkət bildirir. Bunu müəyyən etmək üçün birləşmədəki sonuncu sözə diqqət yetirmək lazımdır.

kitabın otuzuncu səhifəsi – ad bildirən söz birləşməsi
hamıdan gözəl – əlamət bildirən söz birləşməsi
dostlarımdan ikisi – say bildirən söz birləşməsi
tarda gözəl çalmaq – hərəkət bildirən söz birləşməsi

**3** Hansı bənddə hərəkət bildirən söz birləşməsi verilib?

A) dağdan enəndə
B) ağ atlı oğlan
C) dağ yamacı

# İKİ AYI BALASI

İki ayı balası yağlı, iri bir pendir tapmışdı. Amma heç cür bölə bilmirdilər. Qorxurdular ki, birinə az, o birinə çox düşər. Bir tülkü onlara yaxınlaşıb dedi:

- Verin, mən bölüm.

Onlar pendiri tülküyə verdilər. Tülkü pendiri bərabər olmayan iki hissəyə böldü. Ayı balaları o saat qışqırdılar:

- Biri o birindən böyükdur!



Tülkü onları sakitləşdirdi:

- Dayanın, bu saat tən yarı bölərəm.

O, böyük hissədən bir parça dişləyib yedi, ancaq bu dəfə həmin hissə o birindən kiçik oldu. Tülkü pendir tikələrinə baxdı:

- Deyəsən, yenə bərabər deyil.

O yenə böyük pendir tikəsini dişlədi. Ayı balaları bu dəfə də narazı qaldılar. Tülkü pendiri hey dişləyir, dişləyirdi. Ayı balaları isə burunlarını gah bu, gah da o biri tikəyə çevirib narazı qalırdılar.



Tülkü doyunca pendirdən yedi. Axıra iki balaca tikə qaldı.

– Alın yeyin, az da olsa, bərabərdir, – deyə tülkü şələ quyruğunu qaldırıb öz yolu ilə getdi.

## Şüurlu oxu

1. Ayı balaları pendiri bölə bilmirdilər, çünki:
   A) bıçaqları yox idi;
   B) hər biri qorxurdu ki, o birinə çox düşər.

2. Tülkü pendiri bölməyə öz köməyini təklif etdi, çünki:
   A) pendir yemək istəyirdi;
   B) ayı balalarına kömək etmək istəyirdi.

## Düşün və cavab ver

3. Hansı keyfiyyət nağıldakı tülkünün xarakterinə uyğundur?
   A) xəsis B) mehriban C) hiyləgər

4. Nağıldakı ayı balaları haqqında deyilənlərdən hansı düzgün deyil?
   A) əliaçıq B) acgöz C) sadəlövh

QAYDALAR

## CÜMLƏ

Sözün də, söz birləşməsinin də mənası olur. Cümlə isə fikir ifadə edir, yəni varlığın nə etdiyini və ya hərəkətin kim tərəfindən edildiyini bildirir. Müqayisə edin:

tülkü | ayı – sözlər

hiyləgər tülkü | ayı balaları – söz birləşmələri

Hiyləgər tülkü ayı balalarını aldatdı – cümlə

**1** Hansı sırada cümlə verilib?

A) Məktəbin böyük həyəti
B) Məktəbə həvəslə gedən
C) Məktəbdə oxuyuram

**2** Şeirin hansı misrası cümlə deyil?

Dağ dalından günəş gülər,
Yamaclarda quzu mələr,
Ceyran qaçıb suya gələr
Bizim yerdə səhər-səhər.

**3** Verilmiş sözlərdən cümlə düzəlt.

Dost Anar dünən biz qonaq gəl.

**4** Verilmiş sözlərin ardıcıllığını müəyyən et və cümlə düzəlt.

iki bərabər böldü tülkü hissəyə pendiri olmayan

**5** Hansı cümlədə ad bildirən sözlərin sayı daha çoxdur?

A) Bayrama gəlmiş uşaqlar deyib-gülür, çalıb-oynayır, şənlənirdilər.
B) Sinif otağının pəncərəsindən təzə körpü görünür.
C) Yaşıl çəməndə ətirli sarı güllər açılmışdı.

**6** Hansı cümlədə iki söz birləşməsi var?

A) Balaca Əhməd doğma kəndini yadellilərdən qorudu.
B) Oğlan çomaqla ilanı vurub yaraladı.
C) Nənə uşaqlara tapşırdı ki, Cırtdandan muğayat olsunlar.

# CIĞAL SƏRÇƏ

Biri var idi, biri yox idi, Cik-cik xanım adında bir cığal sərçə vardı. Bir gün bu Cik-cik xanım qaratikan çəpərinin üstə qonub tikandan-tikana atılırdı. Qarı nənə də həyətdə təndir qalamışdı. Birdən Cik-cik xanımın ayağına bir tikan batdı, başladı ağlamağa. Qarı tikanı sərçənin ayağından çıxarıb atdı təndirə. Az keçmiş Cik-cik xanım bir o yana, bir bu yana uçub dedi:

– Qarı nənə, mənim tikanımı qaytar özümə.

– Hardan alım? Atdım təndirə, yandı.

– Bilmirəm, tikanımı verməsən, çörəyini götürüb qaçacağam.

Qarı qaldı mat-məəttəl. Cik-cik xanım da o yana uçdu, bu yana uçdu, qarının bir çörəyini götürüb aradan çıxdı.

Göylə uçurdu, gördü bir çoban qoyun sağır. Qondu yerə, çobana yaxınlaşıb dedi:

– Çoban qardaş! Sənə isti çörək gətirmişəm, doğra südə, ye.

Çoban sevincək çörəyi aldı. Elə ki çörəyi yeyib qurtardı, Cik-cik xanım ona dedi:

– Hə, çoban qardaş, indi çörəyimi ver, mən gedim.

– Çörəyi hardan alım, yedim, qurtardı.

– Mənə nə! Çörəyimi ver, yoxsa qoyununu aparacağam.

Cik-cik xanım qanad çalıb havaya qalxdı, bir kök qoyunu caynağına vurub apardı. Çoban onun dalınca düşdü, amma çata bilmədi.



Cik-cik xanım caynağında qoyun özünü yetirdi padşahın sarayına. Gördü burada toydur. Qoyunu verdi qulluqçulara. Qulluqçular qoyunu kəsib yaxşı bozbaş bişirdilər, gətirib qonaqlara payladılar. Cik-cik xanıma yemək çatmadı. O da acığa düşüb padşaha dedi:

– Qoyunumu yediniz. Mən də əvəzində gəlini götürüb qaçacağam.

Bunu deyib Cik-cik xanım gəlinin üstünə şığıdı. Onu caynağına alıb havaya qalxdı.

Cik-cik xanım caynağında gəlin uçurdu. Bir ağaclıqdan saz səsi eşidib yerə endi. Gördü bir aşıq ağac kölgəsində oturub saz çalır. Dedi:

– Salam, aşıq qardaş! Gəl mən gəlinimi sənə verim, sən də sazını ver mənə.

Aşıq gəlini götürüb getdi.

Cik-cik xanım da sazı alıb oturdu ağacın kölgəsində, başladı yavaş-yavaş dınqıldatmağa:

Tikan verdim, çörək aldım,
Sazım dınqır, dınqır, dınqır.
Çörək verdim, qoyun aldım,
Sazım dınqır, dınqır, dınqır.
Qoyun verdim, gəlin aldım,
Sazım dınqır, dınqır, dınqır.
Gəlini verdim, saz aldım,
Sazım dınqır, dınqır, dınqır.



Şüurlu oxu

**1** **Cümlələrin ardıcıllığını nağılın məzmununa uyğun müəyyən et.**

- Cik-cik xanım toydan gəlini qaçırtdı.
- Qarı nənə Cik-cik xanımın ayağından tikanı çıxartdı.
- Cik-cik xanım gəlini verib sazı aldı.
- Çoban çörəyi südə doğrayıb yedi.
- Cik-cik xanım qarı nənənin çörəyini götürüb uçdu.

Düşün və cavab ver

**2** **Kimə qarşı münasibətdə Cik-cik xanım cığallıq etdi?**

A) Padşaha qarşı
B) Qarı nənəyə qarşı
C) Aşığa qarşı

# AZ DANIŞ, ÇOX İŞ GÖR

Bir gün bir nəfər yolla gedirdi. Onun yolunun üstündə bir böyük daş var idi. Yolçu ucadan qışqırdı:

– Ey daş, çəkil yolumdan, sən mənə mane olursan.

Daş yerindən tərpənmədi. Yolçu daşa nə qədər dil tökdüsə, daş yerindən tərpənmədi ki, tərpənmədi.

Bu zaman bir atlı ora yaxınlaşdı. Yolçu ona dedi:

– Qardaş, nə olar, mənə kömək elə. Bu daşı yolumun üstündən götür.

Atlı atdan düşdü. Daşı yoğun kəndirlə sarıdı. Kəndiri atın boynuna bağlayıb atı sürdü. Daş yolun kənarına düşdü.

Yolçu dedi:

– Görürsən? Deyirlər ki, dünyada sözdən güclü heç nə yoxdur. Bayaqdan daşa dağdan ağır sözlər deyirəm. Onun isə heç vecinə də deyil.

– Elədir, – deyə atlı cavab verdi. – Ancaq gərək sözün də qədrini biləsən. Hərdən boş-boş danışmaqdansa, işə keçmək lazımdır.



Şüurlu oxu

**1** Hansı cümlələr mətnin məzmununa uyğun deyil?

1. Yol üstündə yekə bir daş var idi.
2. Yolçu yorulub daşın üstündə oturdu.
3. Atlı yolçuya kömək etmək qərarına gəldi.
4. Atlı daşı atın quyruğuna bağladı.
5. Yolçu atlıya təşəkkür etdi.

**2** Hansı atalar sözü mətnin ideya məzmununa uyğundur?

A) Söz danışıqdan keçər.
B) Əməlsiz sözdə təsir olmaz.
C) Sözün düzünü zarafatla deyərlər.

Dil qaydaları

**3** Altından xətt çəkilmiş cümlədə hansı söz birləşməsi var?

A) kəndiri atın
B) atın boynu
C) bağlayıb atı

**4** Mətndə göy rənglə verilmiş hansı söz birləşməsi ad ifadə edir?

A) böyük daş
B) sözdən güclü
C) dağdan ağır

Söz ehtiyatı

**5** Mənaca uyğun gələn ifadələr hansılardır?

| | |
|---|---|
| dil tökmək | susmağa məcbur etmək |
| dil tapmaq | danışa bilməmək |
| dilini kəsmək | razı salmaq |
| dilə tutmaq | razılaşmaq |
| dili söz tutmamaq | çoxlu yalvarmaq |

# KƏNDLİ VƏ İLAN

Kəndli bir ilanla dostluq edirdi. O, hər gün ilana bir qab süd verir, ilan isə həmin qabın içinə bir qızıl qoyub gedirdi. Bu dostluq xeyli çəkdi. Bir dəfə kəndli xəstələndiyi üçün oğlunu tarlaya göndərdi. Ona tapşırdı ki, qabı süd ilə doldurub bir qırağa qoysun. İlanın verdiyi qızılı isə evə gətirsin.

Oğlan südlə dolu qabı bir tərəfə qoyub gözlədi. İlan südü içməyə gəldi. Oğlan fikirləşdi ki, hər gün süd verib əvəzində bir qızıl almaqdansa, ilanı öldürüb xəzinəyə sahib olmaq lazımdır.

O, cəld çomağı götürüb ilana hücum etdi. Onlar xeyli vuruşdular. Oğlan ilanın quyruğunu yaraladı. Amma ilan da cəld tərpəndi və oğlanı vurub öldürdü.

Bir müddətdən sonra kəndli yenə də tarlaya gəldi. Quyruğu yaralanmış ilan kolun dibindən ona baxırdı. Kəndli dedi:

– Qardaş, mənim ürəyimdən oğul yarası, səninkindən quyruq yarası silinən deyil. Daha bizim dostluğumuz tutmaz.

Beləliklə, kəndli ilə ilanın dostluğu pozuldu.



Hansı atalar sözü mətnin ideyasına uyğun gəlir?

A) İlan vuran ala çatıdan qorxar.

B) Artıq tamah baş yarar.

C) İlanın ağına da lənət, qarasına da.

QAYDALAR

## CÜMLƏNİN NÖVLƏRİ

Siz artıq bilirsiniz ki, söz və söz birləşməsindən fərqli olaraq, cümlə müəyyən bir fikir ifadə edir. Bu fikir müxtəlif cür ifadə oluna bilər. Danışan adam cümlə vasitəsilə
1) nə isə xəbər verə bilər;
2) nəyi isə soruşa bilər;
3) əmr və ya xahiş edə bilər.

1-ci növ cümlələr nəqli cümlə, 2-cisi sual cümləsi, 3-cüsü isə əmr cümləsi adlanır.

Dünən müəllim bizi muzeyə aparmışdı. – nəqli cümlə
Bu il yay tətilini harada keçirəcəksən? – sual cümləsi
Dərslərini yaxşı oxu! – əmr cümləsi

Nəqli cümlənin sonunda nöqtə (.), sual cümləsinin sonunda sual işarəsi (?), əmr cümləsinin sonunda nöqtə və ya nida işarəsi qoyulur.

**1** Aşağıdakı cümlələri əvvəlcə nəqli, sonra sual cümləsi kimi oxu. İntonasiyalar arasındakı fərqə diqqət yetir.

Bu gün Həyat bilgisi dərsimiz var.
Bakı qədim şəhərdir.
Sən məktəbə avtobusla gəlirsən.
Fil dəvədən böyükdür.

**2** Hansı cümlənin sonunda sual işarəsi olmalıdır?

A) Nənə hər axşam nəvələrinə maraqlı nağıllar danışır
B) Müəllimin tapşırdığı şeiri mütləq əzbərlə
C) Bakı şəhəri hansı dənizin sahilində yerləşir

**3** Hansı atalar sözü nəqli cümlədir?

A) Sən ağa, mən ağa, inəkləri kim sağa
B) Pis olmasa, yaxşının qədri bilinməz
C) Yaxşılıq elə ki, başına gəlsin

**4** Hansı atalar sözü əmr cümləsidir?

A) Ot kökü üstə bitər.
B) Gül tikansız olmaz.
C) Cahil ilə bal yemə, aqil ilə daş daşı.



# CIRTDAN


1
Biri vardı, biri yoxdu,
bir qarı vardı...
2
Bir gün qonşu uşaqlar
meşəyə odun yığmağa
gedirdilər...




Mətnin hər bir hissəsinin davamını tap və nağılı oxu.

**A** – Ay Cırtdan, sən niyə odun yığmırsan?
Cırtdan cavab verdi:
– Nənəm məni sizə tapşırıb, mənim üçün də odun yığın.

**B** Bu qarının balaca bir nəvəsi vardı. Hamı onu Cırtdan deyə çağırırdı.

**C** Cırtdan da onlara qoşulub oduna getmək istədi. Qarı uşaqları çağırıb hərəsinə bir yağ yaxmacı verdi, tapşırdı ki, Cırtdandan muğayat olsunlar.

**Ç** – Nənəm məni sizə tapşırıb, mənim də odunumu götürün.
Uşaqlar gördülər başqa əlac yoxdur, Cırtdanın da odununu götürdülər.




Mətnin hər bir hissəsinin davamını tap və nağılı oxu.

**D**

– Hamı yatmış, Cırtdan oyaq.
Div soruşdu:
– Cırtdan, indi niyə yatmırsan?
Cırtdan dedi:
– Hər gecə nənəm mənə çaydan xəlbirlə su gətirərdi.
Div ayağa qalxdı, bir xəlbir götürüb çaydan su gətirməyə getdi.

**E**

Axşam oldu, qaranlıq düşdü. Uşaqlar yolu azdılar. Gəlib yolayrıcına çıxdılar. Gördülər ki, bir tərəfdən işıq gəlir, o biri tərəfdə it hürür. Cırtdan dedi:
– İt hürən tərəfə getsək, bizi it tutar. Gəlin işıq gələn tərəfə gedək.




ə

– Hamı yatmış, Cırtdan oyaq.
Div soruşdu:
– Cırtdan, niyə yatmırsan?
Cırtdan dedi:
– Nənəm mənə hər gecə yatmamışdan qabaq qayğanaq yedirdərdi.
Div tez qayğanaq bişirib Cırtdana yedirtdi ki, bəlkə, yata.

F

Div uşaqları görüb öz-özünə dedi:
"Yaxşı oldu. Gecə onları yeyib qarnımı doyuraram".
Div uşaqlara süfrə açdı, çörək yedirdib yatırtdı.




Div gedəndən sonra Cırtdan tez yoldaşlarını oyadıb dedi:

– Bu div bizi yemək istəyir. Durun tez qaçaq.

Uşaqlar tez qalxıb qaçdılar, çayın o biri üzünə keçdilər.

Div uşaqları görüb istədi ki, o da çayı keçsin, amma keçə bilmədi. Axırda uşaqları səslədi:

– Ay uşaqlar, sudan nə təhər keçdiniz?

Cırtdan tez cavab verdi:

– Get bir dəyirman daşı tap, boynuna keçir, özünü suya at. Onda keçərsən.

Div Cırtdanın sözünə inandı. Gedib bir dəyirman daşı tapdı, boynuna keçirib özünü suya atdı. Elə oradaca boğulub öldü.

## Şüurlu oxu

**1** Cırtdan tənbəl idi, yoxsa qoçaq?
Mətndən Cırtdanın qoçaq olduğunu göstərən abzasları tap.
Mətndən Cırtdanın tənbəl olduğunu göstərən abzasları tap.

## Düşün və cavab ver

**2** Nənəsi uşaqlara yağ yaxmacı vermişdi deyə Cırtdan tələb edirdi ki, uşaqlar onun əvəzinə odun daşısınlar. Cırtdanın bu hərəkətini necə qiymətləndirirsən?

## Doğru, yoxsa yanlış

**3** Cırtdanın nənəsi uşaqlara yağ yaxmacı verdi ki, onlar:
A) ac qalmasınlar;
B) Cırtdanın əvəzinə odun yığsınlar.

**4** Div uşaqları görəndə sevindi, çünki:
A) çox qonaqpərvər idi;
B) bərk acmışdı.

**5** Cırtdan gecə yata bilmirdi, çünki:
A) könlünə qayğanaq düşmüşdü;
B) bilirdi ki, div onları yemək istəyir.

**6** Div çayda boğulub öldü, çünki:
A) çox ağır idi;
B) ağılsız idi.

## Söz ehtiyatı

| | |
|---|---|
| xəlbir | taxıl üyütmək üçün dəyirmi daş |
| şələ | üzərinə yağ çəkilmiş çörək parçası |
| yaxmac | yolların kəsişdiyi yer |
| dəyirman daşı | taxılı zibildən təmizləmək üçün qab |
| yolayrıcı | odun və ya ot bağlaması |

# YALANÇI ÇOBAN

## I hissə

Ucqar dağ kəndində bir çoban yaşayırdı. O, hər gün səhər kənd camaatının qoyun-quzusunu yığıb otarmağa aparır, bütün gününü qoyunlarla keçirirdi.

Bir gün çoban, həmişəki kimi, sürünü otarırdı. O, çox darıxırdı. Ətrafda kəlmə kəsməyə bir adam yox idi. Qoyunlar da danışa bilmirdi ki, onlarla söhbət eləsin. Axırda çoban qərara gəldi ki, kənd camaatı ilə zarafat etsin. Kəndin yaxınlığındakı təpənin üstünə çıxıb var gücü ilə qışqırdı:

– Ay camaat, köməyə gəlin. Sürüyə canavar girib.



Kəndlilər onun səsini eşitdilər. Kimisi əlinə yaba, kimisi balta alıb otlağa tərəf qaçdı.

Çoban çomağını əlinə alıb «Aldatdım, aldatdım» deyə-deyə oynamağa başladı.

Adamlar başlarını bulayıb narazı halda kəndə qayıtdılar.

Aradan bir neçə gün keçdi. Bir gün axşamüstü yenə təpənin başından çobanın səsi gəldi:

– Ay aman, imdad! Canavar qoyunu apardı!

Adamlar yenə də əllərinə keçəni götürüb təpənin o tayına qaçdılar. Çoban yenə də gülə-gülə onları lağa qoydu.



Düşün və cavab ver

1 Müəllifin yerinə olsaydın, hekayəni necə davam etdirərdin?

2 Mətndəki mavi rəngli boşluğa hansı cümlə uyğun gəlir?

A) Gəlib gördülər ki, canavar sürüdəki qoyunları parçalayıb.
B) Çobana kömək edib canavarı öldürdülər.
C) Gəlib gördülər ki, canavar-zad yoxdur.

Dil qaydaları

3 Hansı sözdə «*lar*» sonluğu «*rar*» kimi tələffüz edilir?

A) qoyunlar B) adamlar C) canavarlar

4 Hansı bənddə söz birləşməsi yoxdur?

A) ucqar dağ kəndi, kənd camaatı
B) qoyun-quzu, axşamüstü
C) çobanın səsi, təpənin üstü

## II hissə

Bir müddət də keçdi. Günlərin bir günü çoban yenə qoyunları otarırdı. Birdən meşədən üç canavar çıxıb sürüyə hücum etdi. Başladılar əllərinə keçən qoyun-quzunu parçalamağa. Çoban gördü ki, canavarlarla bacarmayacaq. Kəndə tərəf qaçıb qışqırmağa başladı:

– Ay camaat, qoymayın! Canavar sürünü qırıb qurtardı!

Kənd camaatı həyət-bacada öz işi ilə məşğul idi. Adamlar səs gələn tərəfə baxdılar. Ancaq heç kim yerindən tərpənmədi. Onlar artıq çobana inanmırdılar. Beləcə, canavarlar sürünün axırına çıxdı.

Şüurlu oxu

5 Mətnin hissələrini adlandır.

6 «Yalançı çoban» hekayəsinin 2-ci hissəsini öz yazdığın variantla müqayisə et. Müəllif variantı ilə sənin variantın arasında oxşarlıq varmı? Hansı daha maraqlıdır?

7 Hansı atalar sözü mətnin ideyasını ifadə edir?

A) Sürüdən ayrılan qoyunu qurd yeyər.
B) Yalançının evi yandı, heç kim inanmadı.
C) Qurddan qorxan qoyun saxlamaz.

QAYDALAR

## NİTQ ETİKETLƏRİ

Elə sözlər və ifadələr var ki, ətrafdakılara xoş təsir bağışlayır. Belə sözləri məqamında işlədən adama qarşı hamının münasibəti daha yaxşı olur.

Məsələn, dostundan qələm istəyərkən cümlənin əvvəlində "zəhmət olmasa" və ya "xahiş edirəm" ifadələrini işlətsən, o heç vaxt səndən qələmini əsirgəməz.

## SƏHNƏCİK

### Bacını tariflə.

Böyük bacın sənin ad gününə şirniyyat bişirmişdir. Dostlarınla birlikdə şirniyyatın dadına baxırsınız və onu çox bəyənirsiniz. Hamı bacını tərifləyir və ona təşəkkür edir. O da təşəkkürlərə cavab verir.

### Atandan xahiş et.

Riyaziyyatdan məsələni həll etməkdə çətinlik çəkirsən. Bu işdə sənə yalnız atan kömək edə bilər. O isə evə yenicə gəlib, çox yorğundur. Atana elə müraciət et ki, səndən köməyini əsirgəməsin.

İşlətdiyiniz cümlələrdə tərif, təşəkkür bildirən sözləri yazı taxtasında yazın.

1 Gecə vaxtı başqasından ayrılanda nə demək lazımdır?
A) Gecən xeyrə qalsın.
B) Axşamın xeyir.
C) Gecən xeyir.

2 "İşıqlığa çıxasan" ifadəsini hansı hallarda işlədirlər?
A) Gecə ay çıxanda
B) Səhər hava işıqlaşanda
C) Qaranlıq otaqda işığı yandıranda

3 Biri sənə təşəkkür etdikdə ona nə cavab verərsən?
A) Sağ olun.
B) Buyurun.
C) Yeri yoxdur.

# BABANIN NAĞILI

– Biri vardı, biri yoxdu, Sarıpapaq adında bir qız vardı.

– Yox!

– Hə, yadıma düşdü. Qırmızıpapaq. Bir gün anası onu çağırıb deyir: «Al bu yağ yaxmacını, apar nənənə».

– Aaa... Düz demirsən.

– Yaxşı, yaxşı. Qız meşə ilə gedəndə qarşısına bir div çıxır.

– Sən hər şeyi qarışdırdın.

– Hə, hə, canavar. Canavar soruşur: «Kim yatmış, kim oyaq?»

– Yox! Yox!

– Yaxşı da, bildim. Qız cavab verir: «Mənə qayğanaq bişir!»

– Heç də belə deyil.

– Doğru deyirsən! Tülkü isə deyir: «İstəyirsən, mən pendiri tən yarı bölüm».

– Hansı tülkü, nə pendir? Ay baba, aləmi qarışdırdın. Sən heç nağıl danışa bilmirsən ki...



Düşün və cavab ver

1. Baba hansı nağılları qarışdırıb?
2. Səncə, baba nağılları huşsuz olduğuna görə qarışdırıb, yoxsa nəvəsini yoxlayırdı?

1. "Ağıl yaşda deyil, başdadır" atalar sözünü hansı nağıla aid etmək olar?
   A) "Balaca Əhməd"
   B) "Kəndli və ilan"
   C) "İki ayı balası"

2. Hansı nağılda eyni hadisə üç dəfə təkrar olunur?
   A) "Az danış, çox iş gör"
   B) "Yalançı çoban"
   C) "Babanın nağılı"

3. Cırtdan sənə hansı nağılın qəhrəmanını xatırladır?
   A) "İki ayı balası"ndakı tülkünü
   B) "Yalançı çoban"dakı çobanı
   C) "Balaca Əhməd"dəki Əhmədi

4. Cümləni sözlərə ayır və oxu.
   Məlikməmmədvəqardaşlarıazgetdilərçoxgetdilərgəlibçatdı-larbirquyununbaşına.

5. "*Turqut yayda istirahət etmək üçün kəndə gedəcək*" cümləsində hansı suala cavab yoxdur?
   A) Kim yayda kəndə gedəcək?
   B) Turqut nə vaxt kəndə gedəcək?
   C) Turqut yayda hara gedəcək?
   Ç) Turqut kəndə kiminlə gedəcək?
   D) Turqut yayda nə üçün kəndə gedəcək?

6. Hansı atalar sözündə dörd cümlə var?
   A) Yaz bitirir, yay yetirir, payız gətirir, qış aparır.
   B) Yazda oynayar, gülər, qışda acından ölər.
   C) Ölmə, eşşəyim, yaz gələr, yonca bitər.

7. Şeir parçasının hansı misrası söz birləşməsidir?
   A) Gəlin bir ocaq çataq,
   B) Bişirək asta-asta,
   C) Duzlanmış göbələklər
   Ç) Qoy ağlasın köz üstə. (*Xəlil Rza*)

BÖLMƏ 8

# YAXŞI NƏDİR, PİS NƏDİR?

- Yazı və tələffüz
- Sözün mənası
- Sözün tərkibi
- Söz birləşməsi və cümlə





# TƏNBƏL

İsti yay günü Tənbəl talada uzanıb yuxuya getmişdi. Günəş yuxarı qalxdıqca şüaları daha da isti olurdu. Tənbəl bir də o vaxt oyandı ki, istidən bütün bədəni yanır. Amma durub kölgədə uzanmağa, yerini dəyişməyə tənbəllik etdi. Günəşə dedi:

– Ay Günəş, istidən bişdim axı. Nə olar, bir az o tərəfə, ağacların dalına çəkil.

Günəş gülüb dedi:

– Sən deyirsən, indi mən boyda Günəş bir Tənbəlin arzusu ilə yerimi dəyişim? Heç elə şey olar?

Tənbəl hirslənib qışqırdı:

– Deməк, sən çəkilmək istəmirsən, hə?

– İstəmirəm, – Günəş dedi.

– Aha, belə?! Onda mən də sənin acığına yerimdən tərpənməyəcəyəm. Elə buradaca uzanacağam.



## Şüurlu oxu

1. Tənbəllə Günəşin söhbəti nə vaxt baş verir?
   A) səhər tezdən
   B) gecə
   C) günorta

## Söz ehtiyatı

2. "Tala" sözünün izahı hansı bənddə düzgün verilib?
   A) meşədə ağacsız, açıq sahə
   B) evin damı
   C) dağın zirvəsi

3. Mətndə göy rəngdə verilmiş "arzusu" sözünü hansı sözlə əvəz etmək olar?
   A) məqsədi B) istəyi C) amalı

4. Nöqtələrin yerinə hansı sözlər olmalıdır?

| | |
|---|---|
| tənbəl | qoçaq |
| gülmək | ağlamaq |
| isti | ... |
| yanmaq | ... |
| uzun | ... |

## Dil qaydaları

5. Əmr cümləsini göstər.
   A) Demək, sən çəkilmək istəmirsən, hə?
   B) Nə olar, bir az o tərəfə, ağacların dalına çəkil.
   C) Elə buradaca uzanacağam.

6. Mətndə qırmızı rəngdə verilmiş sözlər:
   A) eyni mənalıdır
   B) yaxın mənalıdır
   C) əks mənalıdır

## YAZI VƏ TƏLƏFFÜZ

1. Yanlış fikri göstər.
   A) "K" hərfinin iki adı var.
   B) Sözlər deyildiyi kimi yazılır.
   C) Hərfi görürük, səsi eşidirik.

2. Sözlərdən birində nöqtələrin yerinə "m" yazmaq lazımdır.
   A) tə...bəl B) sü...bül C) pa...bıq

3. Deyilişi ilə yazılışı fərqlənən sözü göstər.
   A) parta B) dəftər C) qələm

4. Hansı sözdə samitlərdən biri fərqli tələffüz olunur?
   A) meyvə B) konfet C) bitkin

5. Hansı sözdə "ğ" samiti fərqli tələffüz olunur?
   A) bağban B) bağça C) bağlar

6. Sözlərin birində "y" hərfi yazılmamalıdır:
   A) saniyə B) mülayim C) zəyif

7. *"Nefçi" güclü komandadır?*
   Cümlədə səhv sözü göstər.
   A) Nefçi B) güclü C) komandadır

8. *Çimnazgilin ayiləsi bu yay bağda dincələcək.*
   Cümlədə hansı söz səhv yazılıb?
   A) Çimnazgilin B) ayiləsi C) dincələcək

9. Hansı sözdə saitlərdən biri düzgün yazılmayıb?
   A) cəsur B) kampot C) kənt

10. Hansı sözdə samitlərdən biri düzgün yazılmayıb?
    A) ambar B) məqsəd C) qəhraman

# RƏHMLİ KÜÇÜK

Güclü dolu yağırdı. Balaca küçük qaçıb evciyinə girdi. Sonra fikirləşdi: «Bax mən içəridə oturmuşam. Evciyi isə dolu döyəcləyir. Yəqin ki, onu ağrıdır».

Küçük dama çıxıb evciyin üstündə çətir açdı və dedi:

– Hə, indi hər şey qaydasındadır!

Lakin birdən küçüyün ağlına yeni bir fikir gəldi: «İndi dolu məni döymür, evciyi də döymür, çətiri isə döyür. Bəs necə olsun?"

– Axmaq küçük, – deyə pəncərədən baxan pişik donquldandı. – Sən hamını doludan qorumaq istəyirsən? Amma nə etsən də, dolu kimi isə döyəcləyib ağrıdacaq.

Küçük dedi:

– İndi ki belədir, qoy məni ağrıtsın.

Küçük evciyinin damına çıxıb o yan-bu yana qaçmağa başladı. O çalışırdı ki, dolu dənələri evciyə yox, onun üstünə düşsün.

Nəhayət, dolu kəsildi.

– Sən çox rəhmlisən, – deyə pişik küçüyə baxıb nəvazişlə gülümsədi.

– Nə danışırsan? – deyə küçük etiraz etdi. – Sadəcə olaraq, mən istəyirəm ki, hamıya yaxşı olsun.

*G.Tsiferov*



## Düşün və cavab ver

1. Əvvəl küçüyü «axmaq» adlandıran pişik hekayənin sonunda ona «sən çox rəhmlisən» dedi. Pişiyin küçüyə münasibəti nə üçün dəyişdi?

2. Göy rəngdə verilmiş ifadələrdən hansını mətnin başlığı kimi seçərdin?

3. Şifrələnmiş sözü oxu.




4. Hansı cəhətlər küçüyün xarakterinə uyğundur?

həssas, mərhəmətli, axmaq, xeyirxah, qəribə, lovğa, sadəlövh, cəsur, dəcəl, mehriban, qorxaq, yazıq

5. Dolu bərk olduğuna görə adama və ya heyvana dəyəndə ağrıdır. Bəs o daha nəyə ziyan vura bilər? Bu haqda bildiklərini və fərziyyələrini yaz.

## Dil qaydaları

6. Altından xətt çəkilmiş cümlənin sonunda qoyulan işarənin adını de. Bu işarə ilə bitən cümlələr necə adlanır? Həmin cümləni bir daha tələffüz et. Əgər bu cümlənin sonunda nöqtə qoyulsaydı, onu necə tələffüz edərdin?

7. Hansı cümlədə "dolu" sözü əlamət bildirir?

A) Dünən dolu yağmışdı.
B) İri dolu dənələri çiynimə dəyib ağrıdırdı.
C) Dolu vedrəni boşaltdım.

8. Mətndə çəhrayı rəngdə verilmiş "döymək" – "döyəcləmək", "ev" – "evcik" sözləri arasındakı məna fərqini izah et.

# KOBUD



Vasif möhkəm bədənli, güclü oğlandır. Hamı ondan çəkinir. Beləsindən necə qorxmayasan! Yoldaşlarını vurur, qızların saçını dartır, itlə, pişiklə pis rəftar edir, hətta nənəsi ilə kobud danışır.

Bir sözlə, Vasif heç kimdən qorxmur, heç nədən çəkinmir.



Bir gün Vasif yolda gördüyü bir hadisəni sinif yoldaşlarına danışmaq istədi. Amma oğlanlar ona qulaq asmaq belə istəmədilər. Vasif qızların yanına gəldi. O yaxınlaşan kimi qızlar oradan uzaqlaşdılar.

Vasifin kefi pozuldu. Evə gələndə itlə oynamaq istədi. Amma Toplan onu görən kimi küçəyə qaçdı. Hələ Məstanı demirsən! Pişik şkafın üstünə çıxıb qəzəbli, yaşıl gözləri ilə ona baxırdı.

Əlacı kəsilmiş Vasif nənəsinin yanına gəldi. Nənə nəvəsinin üzünə belə baxmadan sakitcə corab toxumağa davam etdi.

Güclü, qorxmaz Vasif tək qalmışdı.

Lap tək-tənha!





## LOVĞA

Bir uşaq lovğalandı,
Kükrədi, dalğalandı,
Qabartdı sinəsini,
Bərk çıxartdı səsini.
Gördü pisdir ədası,
Yoxdur bunun faydası.
Hamı çıxdı sözündən
Lovğa küsdü özündən.



### Söz ehtiyatı

"Kobud" və "lovğa" sözlərinin mənaca əksi olan sözləri tap.

### Düşün və cavab ver

1. Mətnlərə əsasən de: lovğalığın və kobudluğun nəticəsi nə olur?
2. Sinfinizdə ən güclü oğlan kimdir? O da kobud və ya lovğadırmı?

### Doğru, yoxsa yanlış

| | D | Y |
|---|---|---|
| Vasif cəsur və qorxmaz oğlandır. | ☐ | ☐ |
| Güclü adamların heç də hamısı kobud olmur. | ☐ | ☐ |
| Sinifdə Vasifdən başqa hamı qorxaq idi. | ☐ | ☐ |
| Pişik Vasifi görən kimi həyətə qaçdı. | ☐ | ☐ |
| Vasif nənəsinə yanaşanda o, corab toxuyurdu. | ☐ | ☐ |
| Nənəsi Vasifi yalqız görüb onun könlünü aldı. | ☐ | ☐ |

# SÖZÜN MƏNASI

| Yaxın mənalı sözləri müəyyən et. | | Əks mənalı sözləri müəyyən et. | |
|---|---|---|---|
| hücum | sarımaq | arxa | müxtəlif |
| dənə | yubanmaq | əyri | qabaq |
| dolamaq | ədəd | dar | haram |
| hasar | həmlə | eyni | düz |
| ləngimək | barı | halal | geniş |

1. Həm ad, həm də hərəkət bildirən sözü göstər.
   A) sat B) yat C) qat

2. Hansı cərgədə əks mənalı əlamət bildirən sözlər verilmişdir?
   A) göyçək, qəşəng
   B) gözəl, eybəcər
   C) dərə, təpə

3. Hansı cərgədə yaxın mənalı ad bildirən sözlər verilmişdir?
   A) dünya, aləm
   B) xeyir, şər
   C) aparmaq, daşımaq

4. "Bağışlamaq" sözünün belə mənası yoxdur:
   A) hədiyyə etmək
   B) təşəkkür etmək
   C) günahından keçmək

5. Hansı nağılın adında say bildirən söz həm də hərəkət bildirir?
   A) İki ayı balası
   B) Üç qardaş
   C) Əlibaba və qırx quldur

# ZARAFAT

**I hissə**

İki dost şəhər ətrafına gəzməyə çıxmışdı. Bunlardan biri varlı və zarafatcıl bir gənc, digəri isə məşhur *ədib* idi. Dostlar şirin söhbət eləyə-eləyə gəzişirdilər.

Yaxınlıqdakı tarlada kəndlilər işləyirdilər. Yol qırağındakı ağacın altında süfrə salınmışdı. Süfrədə qab-qacaq, yanında bir büt başmaq var idi. Görünür, tarlada işləyənlər burada nahar etmişdilər. Başmaqlar da onlardan birinin idi.

Cavan oğlan dostuna dedi:

– Mən zarafat üçün bunları götürüb gizlədəcəyəm. Qoy yiyəsi işdən qayıdanda başmaqlarını axtarsın, biz də qıraqdan baxıb ləzzət alarıq.

O biri dedi:

– Dostum, əgər bu adam başmaqlarını bulaşdırmaq istəmirsə, deməli, ehtiyac içində yaşayır. Yoxsullarla belə zarafat eləmək yaxşı deyil. Sən dövlətli olduğun üçün onunla başqa cür zarafat eləyə bilərsən. Gəl hər başmağa bir manat pul qoy. Sonra da bir tərəfdə gizlənib tamaşa elə.

Oğlan dostunun dediyinə əməl elədi. Sonra hər ikisi ağac dalında gizləndi.



**II hissə**

Az keçmiş bir kişi işini qurtarıb yorğun halda süfrənin yanına gəldi. Başmaqlarını geyinmək istəyəndə içindəki pulları görüb heyrətlə dörd tərəfə baxdı, ancaq bir adam görmədi. Kişi elə sevinmişdi ki, yerə-göyə sığmırdı. O, dizi üstə çöküb üzünü göyə tutdu:

– Ya Rəbbim, ürəklərin sirrini bilən yalnız Sənsən! Bilirsən ki, körpə uşaqlarım evdə ac-yalavac oturublar, anaları yorğan-döşək xəstəsidir. Özümdə bir qəpik pul yox, başqalarına ağız açmağa da üzüm gəlmir. İlahi, Sənə çox şükür, məni dardan qurtardın. Ya Rəbbim, bu pulu mənə yetirəni xoşbəxt elə!

Bu səhnə oğlana elə təsir etdi ki, gözləri yaşardı. Dinməz-söyləməz dönüb dostuna baxdı.

Ədib bunu görüb dedi:

– İndi de görüm, hansımızın zarafatı yaxşı oldu?..

Sözlük

***Ədib*** – yazıçı, şair

Şüurlu oxu

1. Mətnin ideya məzmunu nədən ibarətdir?
   A) Zəhmətlə qazanılan pul halal olur.
   B) Dostun sözünə həmişə qulaq asmaq lazımdır.
   C) Kasıblara qarşı xeyirxah olmaq lazımdır.

Düşün və cavab ver

2. Əgər varlı gənc öz bildiyi kimi zarafat etsəydi, hekayə necə davam edərdi?

Dil qaydaları

3. Düzəltmə sözü göstər.
   A) zarafatcıl
   B) süfrə
   C) qab-qacaq

# DOSTLAR SƏFƏRDƏ

Tülkü, qunduz və qaban bir yerdə səfərə çıxmağı qərara aldılar. Meşələrdə, dağlarda gəzmək, görmədikləri yerləri görmək istəyirdilər.

Onlar yığışıb yola düşdülər. Getdilər, getdilər, qarşılarına bir çay çıxdı. Çayın üstündən dar bir körpü keçirdi. Üçü də birdən bu körpüdən keçə bilməzdi. Bir-bir keçmək lazım idi.

Qaban qunduza dedi:

– Sən birinci keç. Yol böyüyündür.

– Düzdür, qoy birinci qunduz keçsin, – deyə tülkü razılaşdı.

Qunduz ayağını körpüyə qoydu. Bir-iki addım getmişdi ki, körpünün çürümüş taxtaları sındı. Qunduz suya düşdü.



– Ay aman! Fəlakət! – deyə tülkü qışqırdı. – Qaban, suya atıl, qunduzu xilas elə. Yoxsa bizim qunduz batacaq. Tez ol! Tez ol!

– Mən atılardım, – deyə qaban donquldandı. – Amma su soyuqdur. Qorxuram xəstələnəm. Bəlkə, sən atılasan?

– Nə danışırsan?! Mən quyruğumu yenicə daramışam.

Bu zaman körpünün altından qunduzun səsi gəldi:

– Sağ olun, lazım deyil. Özüm birtəhər çıxaram.

Qunduz sahilə çıxdı. Tülkü və qaban sevindilər:
– Nə yaxşı oldu! Gəlin yolumuza davam edək.
Qunduz onlara baxıb dedi:
– Yox, mən getmirəm. Sizinlə yoldaş olan yolda qalar.

*S.Mixalkov*

Düşün və cavab ver

1. Nə üçün qunduz yola davam etmək istəmədi?
2. Hansı atalar sözü bu nağılın məzmununa uyğun gəlir?
   A) Yalançını evinəcən qovarlar.
   B) Dost dosta tən gərək,
   Tən olmasa, gen gərək.
   C) Örtülü bazar dostluğu pozar.
3. Hekayədəki dostlar haqqında nə deyə bilərsən? Tülkü ilə qabanı əsl dost hesab etmək olarmı?

## MƏSTANIN DOSTLUĞU

Orxan bir şey yeyəndə Məstan yanında hazır olur. Birinci tikəni Məstan, ikincini Orxan yeyir. Yemək qurtaran kimi Məstan yoxa çıxır.

Onu axtarmaq lazım gələndə Orxan mətbəxə girib yeməli bir şey götürür. Onda Məstan həmin dəqiqə dostunun yanında hazır olur: "Myau", yəni buradayam.

Şüurlu oxu

1. Hansı fikir doğrudur?
   A) Məstan Orxanın sinif yoldaşıdır.
   B) Məstan Orxangilin pişiyidir.
   C) Məstan Orxangilin küçüyüdür.
2. Hansı atalar sözü mətnin məzmununa uyğun deyil?
   A) Dost dostun eybini üzünə deyər.
   B) Dostam səninlə, pulun qurtaranacan.
   C) Tikə ilə dost olanlar illərlə küsülü qalar.

# ƏSL DOSTLUQ



**I hissə**

Bir kənddə Nicat adlı balaca bir oğlan yaşayırdı. O, hər gün şəhərə su aparıb satardı ki, ata-anasına kömək olsun. Bu işdə ona Dəcəl adlı balaca eşşək kömək edərdi. Nicat eşşəklə elə dostlaşmışdı ki, bir gün belə ondan ayrı dura bilmirdi.

Bir gün yenə Nicatla Dəcəl evdən çıxdılar. Anası Nicata çörək də verdi ki, yolda ac qalmasınlar. Dostlar *səhəngə* bulaq suyu doldurub şəhərə yetişdilər. Bütün günü şəhəri gəzib-dolaşdılar, camaata su satdılar.

Axşam düşdü, qaş qaraldı. Dostlar şəhərin kənarında bir otluq yerdə gecələməyi qərara aldılar. Oturub çörək yedilər, su içdilər. Bir də gördülər ki, səhəngin ağzında bir böcək var. Nicat əli ilə böcəyi qovmaq istəyəndə barmağı dəydi, böcək suyun içinə düşdü. Yazıq böcək səhəngin içində ha çalışırdı ki, sudan çıxsın, sürüşüb yenidən suya düşürdü. Nicat dedi: «Yaxşı olur sənə, mənim səhəngimdə nə işin var idi?!»

Beləcə, Dəcəllə Nicat otların üstündə büzüşüb yatdılar. Böcək isə səhəngin içində qaldı...

Şüurlu oxu

***Səhəng*** – su daşımaq üçün mis və ya saxsı qab

**II hissə**

Səhər dostlar yuxudan oyanıb nə görsələr yaxşıdır? Nicat da, Dəcəl də kiçilib otdan balaca olmuşdular. Hələ bu, bir yana qalsın, Dəcəl insan kimi dil açmışdı. O dedi:

– Nicat, mən bilən, bütün sirr böcəkdədir. Sən axşam ona kömək eləmədin axı!..

Nicat dedi:

– Düz deyirsən. Kömək elə, böcəyi səhəngdən çıxaraq, bəlkə, tilsim qırıldı.

Nicat Dəcəlin belinə mindi. Əlini uzadıb səhəngin qulpundan yapışdı. O, yuxarı çıxmaq istəyəndə birdən səhəng aşdı, içindəki su töküldü. Böcək də su qarışıq torpağa düşdü.

Nicat üzünü böcəyə tutub dedi:

– Məni bağışla, ay böcək,

1

Bəs indi biz neyləyəcəyik, evə necə gedəcəyik?

Böcək dedi:

– Nicat, gecə acığım tutdu, sizi ovsunladım. İndi görürəm, ikiniz də xeyirxahsınız. Daha sizə acığım tutmur. Ancaq mən ikinizdən birini əvvəlki vəziyyətə qaytara bilərəm. İndi seçin!



Düşün və cavab ver

1 Nicatın yerinə olsaydın, böcəyə nə deyərdin?

Dəcəl dedi:

– Nicatı böyüt. 2 .

Nicat dedi:

– Yox, yox! Dəcəli böyüt. 3 .

Bunu görən böcək dedi:

– Mən sizi sınayırdım. İndi gördüm ki, əsl dostsunuz. Sizin ikinizi də böyüdərəm.

Böcək bir ovsun oxudu və dostlar əvvəlki boyda oldular. Onlar sevincək böcəyə «çox sağ ol» deyib yola düzəldilər.

Şüurlu oxu

**2** Hansı cümlə mətnin ideyası ilə bağlı deyil?

A) İnsan dostu uğrunda qurban verməyi bacarmalıdır.
B) Kiçik uşaqlar alverlə məşğul olmamalıdırlar.
C) Dara düşənlərə kömək etmək lazımdır.

**3** Cümlələrin ardıcıllığını müəyyən et.

A) Nicat su içmək istəyəndə dolçanın içinə bir böcək düşdü.
B) Qaranlıq düşəndə dostlar çöldə gecələməyi qərara aldılar.
C) Böcək bir ovsun oxuyub dostları böyütdü.
Ç) Bir gün Nicatla Dəcəl su satmaq üçün şəhərə yollandılar.
D) Səhər duranda gördülər ki, ikisi də bapbalaca olub.
E) Nicat böcəyə kömək etmədiyinə görə ondan üzr istədi.

**4** Aşağıdakı cümlələri uyğun gələn mavi boşluqların yerində işlət.

- Axı səhvi mən etmişəm.
- Axı ata-anası onun yolunu gözləyir.
- Dünən səni darda qoydum.

Söz ehtiyatı

**5** Mətnin sonuncu cümləsində göy hərflə verilmiş ifadəni hansı sözlə əvəz etmək olar?

A) sağollaşıb
B) xudahafizləşib
C) təşəkkür edib

# SÖZÜN TƏRKİBİ

1. *Neft çıxaran – neftçi*
*Pambıq becərən – pambıqçı*
*Paltar tikən – ...*
Nöqtələrin yerinə uyğun gələn sözü göstər:
A) paltarçı
B) dərzi
C) toxucu

2. *Odunçu, üzümçü, ovçu, ...*
Ardıcıllığı hansı sözlə davam etdirmək olar?
A) yalançı
B) balıqçı
C) əlaçı

3. Cümlələrdən birində iki sözün kökü eynidir:
A) Bağban bir dəstə gül bağladı.
B) Anam gülləri güldana qoydu.
C) Fəhlə daşları araba ilə daşıyırdı.

4. Hansı sözlər birləşəndə alınan mürəkkəb söz defislə yazılır?
A) dəvə, tikan
B) qol, budaq
C) toz, soran

5. “Dost” sözünə hansı şəkilçini əlavə etdikdə düzəltmə söz yaranır?
A) -um B) -la C) -luq

6. Hansı şöz düzəltmə deyil?
A) dəftərçə B) sərçə C) döşəkçə

# LOVĞA TÜLKÜ

Günlərin birində tülkü ilə kirpi söhbət edirdilər. Birdən otların arasından bir ilan çıxdı. Tülkü qorxusundan tir-tir əsdi, kirpiyə yalvarmağa başladı:

– Amandır, kirpi qardaş, məni bu *əfi ilanın* əlindən qurtar.

Kirpi ilanı öldürdü. Tülkü ölmüş ilanı yabanın ucuna keçirib, meşəyə gəldi. Meşədəki heyvanlar – şir, ayı, canavar, pələng, çaqqal tülkünün başına yığışdılar. Tülkü ölmüş ilanı onlara göstərib özünü tərifləməyə başladı:

– Baxın, mən ilanların *qənimiyəm*.

Birdən kolluqdan başqa bir ilan çıxdı. Heyvanlar bir ağızdan qışqırdılar:

– Tülkü qardaş, bu ilanı da öldür, yoxsa bizi çalar.

Ancaq baxıb gördülər ki, tülkünün heç izi-tozu da qalmayıb. Qorxusundan hamıdan əvvəl qaçıb canını qurtarıb.



## Sözlük

***Əfi ilan*** – zəhərli ilan növü
***Qənim olmaq*** – cəza vermək, öldürmək

## Düşün və cavab ver

1. Mətndə göy rəngdə verilmiş "*çalar*" sözünü cümlələrdə başqa mənalarda işlət.

2. Mətndə adı çəkilən heyvanlardan biri şəkildə yoxdur. Bu, hansı heyvandır?

3. Nağıldakı tülkü:
   A) lovğadır
   B) cəlddir
   C) qoçaqdır

4. Hansı atalar sözü mətnin məzmununa uyğun gəlir?
   A) İlanın ağına da lənət, qarasına da.
   B) Lovğalığın sonu xəcalətdir.
   C) İgid ölər, adı qalar.

## Söz ehtiyatı

5. Mənaca yaxın olan söz və ifadələri müəyyən et.

| | |
|---|---|
| izi-tozu da qalmayıb | xilas olub |
| başqa | çığırdılar |
| canını qurtarıb | aradan çıxıb |
| qışqırdılar | lakin |
| ancaq | özgə |

# MEŞƏ KRALI

### I hissə

Biri vardı, biri yoxdu, bir şir vardı. Bu şir hamıdan güclü idi. Ona meşənin kralı deyirdilər. O, hər səhər heyvanları yığıb əmrlər verirdi. Vay o heyvanın halına ki, kralın əmrini yerinə yetirməsin.

Şir çox qəddar idi. Heyvanlara göz verib, işıq vermirdi. Onun sözündən çıxanları amansız cəza gözləyirdi. Meşənin bütün sakinləri kraldan qorxurdu və heç kim onu sevmirdi.

### II hissə

Bir gün səhər meşə sakinləri, həmişəki kimi, talada toplaşıb kralı gözləyirdilər. Ancaq şir gəlib çıxmaq bilmirdi ki, bilmirdi. Gözləməkdən yorulan çaqqal dedi:

– Kral səhər yığıncağına gecikən deyildi. Yəqin, nə isə baş verib. Gəlin birimiz gedək, ondan bir xəbər bilək.

Meşə sakinləri belə qərara gəldilər ki, meymunu kralın yanına göndərsinlər.

### III hissə

Şiri öz yuvasında halsız görən meymun soruşdu:

– Ey böyük kral, sənə nə olub? Yoxsa yaralanmısan?!

– Xəstələnmişəm, – deyə şir cavab verdi. – Ayaq üstə dura bilmirəm. Dünəndən bəri dilimə bir şey dəyməyib. Mənə yemək tapın.

Meymun «baş üstə» deyib bayıra çıxdı. Xəbəri meşədəkilərə çatdırdı. Bunu eşidən tülkü dedi:

– Lap yaxşı oldu. Onu görüm həmişə yataqda qalsın. Qoy öz yuvasında acından ölsün. Sağalsa, yenə bizə zülm edəcək.

Hamı tülkü ilə razılaşdı.

### IV hissə

Günlər keçir, heç kim şirə baş çəkmirdi. Meşə kralı günü-gündən zəifləyirdi. O, öz-özünə düşünürdü: «Əlbəttə, heç kim mənə kömək etməyəcək. Axı onlar məndən yalnız zülm, qəddarlıq görüblər. Ah, kaş ki heç kəsə pislik etməyəydim».

Meşə sakinləri isə şad-xürrəm həyat sürürdülər. Kim nə istəyirdi, edirdi. Bir gün yığıncaqda ceyran söz alıb dedi:

– Meşə kralı həmişə güclü olub. İndi isə zəifdir. Yəqin ki, köməksizliyin nə olduğunu artıq başa düşüb. Gəlin biz ona qarşı qəddar olmayaq.

### V hissə

Heyvanlar ceyranla razılaşdılar. Onlar krala yem tapdılar, onun sağalması üçün əllərindən gələni etdilər.

Tezliklə şir sağaldı. Amma artıq o, zalım kral deyildi. İndi meşə kralı hamının dostu olmuşdu.

Beləcə, meşədə pislik sona yetdi. Yaxşılıq isə əbədi olaraq yaşadı.

A


B


C


Ç


D


Şüurlu oxu

**1** Hər bir şəklin mətnin hansı hissəsinə uyğun gəldiyini müəyyən et.

Düşün və cavab ver

**2** Hansı atalar sözü mətnin məzmununa uyğun gəlir?

A) Yaxşılığa yaxşılıq hər kişinin işidir, yamanlığa yaxşılıq nər kişinin işidir.

B) Hirsli başda ağıl olmaz.

C) Sən saydığını say, gör fələk nə sayır.

# İTİ BUCAQSIZ ÖLKƏ

Bir gün Covanni qəribə bir ölkəyə gəlib çıxdı. Bu ölkədə evlər yumru, damlar tağlı idi. Bütün küçələrdə qızılgül kolları əkilmişdi. Covanni güllərdən birini dərib döşünə taxmaq istədi. Əlini ehtiyatla uzatdı ki, barmağına tikan batmasın. Amma tikanlar çox yumşaq idi. Onlar nəinki ələ batmır, hətta barmaqları yüngülcə qıdıqlayırdı.

– Doğrudan da, möcüzədir! – deyə Covanni heyrətlə dilləndi.

Birdən kolların arasından bir polis çıxdı. O gülümsəyərək:

– Məgər bilmirsiniz ki, bu gülləri dərmək olmaz? – deyə soruşdu.

– Üzr istəyirəm, bu haqda heç fikirləşmədim.

Polis çox nəzakətlə dedi:

– Əgər belədirsə, yəni bu hərəkəti bilmədən etmisinizsə, onda cərimənin yarısını ödəyin.

Covanni qəbz yazan polisin qələminə nəzər saldı. Qələmin ucu iti deyildi. Özünü saxlaya bilməyib xahiş etdi:

– Siz mənə öz xəncərinizi göstərə bilərsiniz?



– Böyük məmnuniyyətlə, – deyə polis ucsuz qılıncını göstərəndə Covanni soruşdu:

– Bu nə qəribə ölkədir?

– İti Bucaqsız ölkə!

Polis o qədər nəzakətlə danışırdı ki, hər kəlməsi musiqi kimi qulaq oxşayırdı:

– İndi, zəhmət olmasa, mənə iki şillə vurun.

Heyrətdən Covanninin gözləri bərələ qaldı:

– Rəhm eləyin, mən polisə qarşı kobudluq etdiyimə görə həbs olunmaq istəmirəm. Ona qalsa, siz mənə iki şillə vurmalısınız, mən yox.

– Bizim ölkənin qanunları belədir: tam cərimə – dörd şillə, yarısı iki şillə.

– Polisə?

– Əlbəttə, polisə!

– Axı bu, ədalətsizlikdir!

– Sözsüz! – polis davam etdi. – Günahsız insana şillə vurmaq çox çətindir. Ona görə də hamı çalışır ki, qanunları pozmasın. Bu dəfə mənə iki şillə vurun, amma gələn dəfə diqqətli olarsınız.

– Mən sizə nəinki şillə, heç çırtma da vura bilmərəm. Mən ancaq sizi sığallaya bilərəm.

– Bu halda mən sizi şəhərdən çıxarmağa məcburam.

Xəcalətdən qıpqırmızı qızarmış Covanni İti Bucaqsız ölkəni tərk etməyə məcbur oldu.

*Canni Rodari*

### Şüurlu oxu

1 Polis Covannidən niyə tələb edirdi ki, ona şillə vursun?

2 Mavi rəngli boşluğa hansı cümlə uyğun gəlir?

A) İcazə verin sizi sərhədə qədər ötürüm.

B) Rədd olun bizim ölkədən.

C) Bir də buralara ayaq bassanız, özünüzü ölmüş bilin.

Düşün və cavab ver

3 "İti bucaq" ifadəsi sizə hansı sözləri xatırladır?
*kəskin* *yumşaq* *sancan* *məlahətli*

4 Səncə, müəllif öz əsərini niyə "İti bucaqsız ölkə" adlandırıb?

5 Əsərin qəhrəmanının yerinə olsaydın, polisə şillə vurardınmı? Cavabını əsaslandır.

6 İti bucaqsız ölkədə yaşamaq istəyərdinmi? Bu ölkənin qanunları xoşuna gəldimi?

Araşdırma

7 Böyüklərdən soruş: bizim ölkədə Covanninin hərəkətinə görə hansı cəza tətbiq olunur?

8 Şagird məktəbdə özünü necə aparmalıdır? Bununla bağlı hansı qaydalar var?

9 Şagird məktəbdə davranış qaydalarını pozursa, onu necə cəzalandırmaq lazımdır?
Fikirlərini iki variantda söylə:
I variant – şagirdin bu qaydalardan xəbəri yoxdursa...
II variant – şagird qaydaları bilərəkdən pozubsa...

Dil qaydaları

10 Əsərin adındakı "iti" sözü nəyin əlamətini bildirir: bucağın, yoxsa ölkənin?

11 Göy rəngdə verilmiş sözlər:
A) danışanın kobud olduğunu bildirir;
B) riyakar olduğunu bildirir;
C) nəzakətli olduğunu bildirir.

12 Qırmızı rəngdə verilmiş cümlədə:
- neçə ad bildirən söz var?
- neçə hərəkət bildirən söz var?
- "ehtiyatla" sözü nəyin əlamətini bildirir?

# SÖZ BİRLƏŞMƏSİ VƏ CÜMLƏ

**1** Hansı cərgədə ad bildirən söz birləşmələri verilib?
A) məktəbə gedən, axşam düşəndə
B) çalışqan şagird, mənim dostum
C) uşaqların çoxu, vətəni sevmək

**2** Cərgələrdən birində cümlə verilib:
A) Gözəl yaz səhəri
B) Yayın isti havası
C) Gəl, gəl, a yaz günləri.

**3** Hansı cümlədə altından xətt çəkilmiş söz birləşməsi hərəkət bildirir?
A) Anar <u>məktəbə çatanda</u> dərslər başlamışdı.
B) Sinif <u>yoldaşlarımdan biri</u> dərsə gecikmişdi.
C) Onlar <u>bu hərəkətlərinə görə</u> müəllimdən üzr istədilər.

**4** *Sən gələndə, qaranquş,*
*Bu yerlərə yaz gəlir.*
*Dalınca qatar-qatar*
*Durna gəlir, qaz gəlir.*

Bu şeir parçasında hansı söz birləşməsi yoxdur?
A) ad bildirən
B) say bildirən
C) hərəkət bildirən

**5** Hansı cümlənin sonunda mütləq sual işarəsi olmalıdır?
A) Bakı Azərbaycanın paytaxtıdır
B) Sinfinizdə neçə şagird var
C) Dərslərini yaxşı oxu

**6** Dostun idman yarışına gedəndə onu hansı sözlərlə yola salmaq lazımdır?
☐ Təbrik edirəm!
☐ Tez qayıt!
☐ Müvəffəqiyyətlər!

1 *"Bağda ərik var idi, salam-əleyk var idi. Bağda ərik qurtardı, salam-əleyk qurtardı".*
Bu atalar sözü hansı əsərin ideya məzmununa uyğundur?
A) "Rəhmli küçük"
B) "Dostlar səfərdə"
C) "Məstanın dostluğu"

2 Kimi yaxşı dost adlandırmaq olar?
A) Tülkü və qabanı ("Dostlar səfərdə")
B) Orxan və Məstanı ("Məstanın dostluğu")
C) Nicat və Dəcəli ("Əsl dostluq")

3 Hansı cərgədəki bütün sözlərin tələffüzü yazılışından fərqlənir?
A) tramvay, dəniz, boru
B) xəstə, bıçaq, tənbəl
C) sünbül, arzu, paltar

4 Nümunəyə bax və qalan sözlərə tətbiq et.

| | | |
|---|---|---|
| şüar | çəmən | |
| qatar | payız | şü-**ar**+**pa**-yız = arpa |
| tülkü | lavaş | |
| çiçək | təkrar | |
| ləpə | mələk | |
| mağaza | maral | |
| sual | bitki | |

5 Hansı cərgədə yaxın mənalı sözlər verilmişdir?
A) tapmaq, itirmək
B) gözəl, göyçək
C) gecə, gündüz

6 İzahlardan biri "alışmaq" sözünün mənasına uyğun deyil.
A) alovlanmaq, od tutub yanmaq
B) öyrəşmək, vərdiş etmək
C) bazarlıq etmək

Balıqlar uşaqları çox sevirdilər. Uşaqlar isə sahilə ancaq yayda gəlirdilər. Balıqlar fikirləşdilər ki, bəs dənizin dibində yayın gəlməsini necə bilsinlər? Belə qərara gəldilər ki, qulaqlarını sahildə qoysunlar.

İndi çimərliklərdə nə qədər istəsəniz, ______ tapa bilərsiniz. Balıqlar uşaqların səsini eşidib sahilə yan alırlar.

**1** Mavi zolağın yerinə hansı söz uyğun gəlir?

A) qayıq
B) balıqqulağı
C) balıq

**2** Mətnin mövzusunu müəyyən et.

A) Balıqqulağı necə yaranır?
B) Balıqlar pis eşidirlər.
C) Balıqlar hiyləgərdirlər.

**3** Bunlardan hansı düzəltmə sözdür?

A) balıqqulağı
B) uşaqlar
C) çimərlik

**4** Şeirlərdən biri layladır:

A) Bu qala, bizim qala,
Həmişə bizim qala.
Tikmədim, özüm qalam,
Tikdim ki, izim qala.

B) Bağda sürünər, gəzər,
Az-az görünər gəzər.
Oxşayar bir yumağa,
Qorxuram əl vurmağa.

C) Qoxusu güldən gəlir.
Güldən, bülbüldən gəlir.
Balamın gül beşikdə
Yuxusu birdən gəlir.

**1** Hansı sözdə nöqtələrin yerinə "u" hərfi yazılmalıdır?

A) m...bahisə B) hök...mət C) m..barək

**2** Hansı söz əlifbanın ilk hərfi ilə başlayıb son hərfi ilə bitir?

A) ayaz B) alov C) alay

**3** "Şokolad" sözündə:

A) bir saitin deyilişi ilə yazılışı fərqlidir.
B) bir samitin deyilişi ilə yazılışı fərqlidir.
C) iki sait və bir samitin deyilişi ilə yazılışı fərqlidir.

**4** Hansı tərəvəz adında saitlərdən biri səhv yazılıb?

A) pomidor B) kortof C) soğan

**5** «Müəllim» sözünü deyəndə hansı sait tələffüz edilmir?

A) ü B) ə C) i

**6** «Yaz» sözü hansı cümlədə hərəkət bildirən sözdür?

A) Yaz ayları bunlardır: mart, aprel, may.
B) Ev tapşırığını səliqə ilə yaz.
C) Yaz gələndə təbiət oyanır.

**7** Hansı sırada əks mənalı mürəkkəb sözlər verilib?

A) acgöz – gözütox
B) gözüaçıq – qaragöz
C) əliyalın – gülərüz

**8** Hansı sırada əks mənalı düzəltmə sözlər verilib?

A) enmək – qalxmaq
B) bitişik – ayrı
C) işləmək – dincəlmək

**9** Boş xanada hansı söz olmalıdır?

| | | |
|---|---|---|
| qoyun | → | sürü |
| inək | → | naxır |
| at | → | |

**10** "Bir" sözünə hansı söz qoşulduqda alınan mürəkkəb söz bitişik yazılır?

A) bir B) iki C) başa

**11** Hansı sıradakı sözlər birləşəndə yaranan mürəkkəb söz defislə yazılır?

A) alnı açıq
B) açıq ürəkli
C) açıq aşkar

**12** Xalq mahnılarından birinin adı söz birləşməsi ilə ifadə olunub:

A) "Küçələrə su səpmişəm"
B) "Sona bülbüllər"
C) "Pəncərədən daş gəlir"

**13** Hansı atalar sözü səhv yazılıb?

A) Bu günün işini sabaha qoyma.
B) Dişləməyən işləməz.
C) Ağıl gücdən üstündür.

**14** Hansı atalar sözüdür?

A) Aşpaz Abbas bozbaş asar, o başda, bu başda.
B) Dost dar gündə tanınar.
C) Yumru təkər, əllərdə gəzər.

**15** "Biri var idi, biri yox idi" ifadəsi ilə hansı əsərlər başlanır?

A) hekayə
B) nağıl
C) şeir

**16** Biri sənə təşəkkür etdikdə ona nə cavab verərsən?

A) Dəyməz.
B) Üzr istəyirəm.
C) Zəhmət olmasa.

*Rafiq İsmayılov*
*Gülşən Orucova*
*Zahid Xəlilov*
*Dilrubə Cəfərova*

# AZƏRBAYCAN DİLİ

Ümumtəhsil məktəblərinin
2-ci sinfi üçün dərslik
Bakı, Altun Kitab, 2011

Nəşriyyatın ünvanı:
AZ1130 Bakı, Ə.Naxçıvani küçəsi, 15A
www.altun-kitab.com
E-mail: altun_kitab@yahoo.com
Telefon: (99412) 562 69 88; 562 69 86

Çapa imzalanıb 15.05.2011. Kağız formatı 57x82 1/8.
Fiziki çap vərəqi 26,00. Tirajı 50450 nüsxə.

